# ELMİ İŞ

Azərbaycan Respublikası

Aylıq Beynəlxalq Elmi-nəzəri jurnal

*№ 10 (14)*

# НАУЧНАЯ РАБОТА

Азербайджанская Республика

Ежемесячный Международный

Научно-теоретический журнал

*№ 10 (14)*

# SCIENTICAL WORK

Azerbaijan Republic Amonth International

Science oritical journal's

*№ 10 (14)*

**Bakı – 2009**

# MÜNDƏRİCAT

# DÜNYA BAL ARISININ MÜHAFIZƏSINƏ QALXIB

**Şamil Quliyev,** *Azərbaycan Arıçılar İttifaqının sədri*

Bal arısı yaranışından hazırkı dövrə kimi canlı aləmin təkamülündə, yaşam mümkünlüyünün saxlanmasında və ekoloji tarazlığın qorunmasında mühüm rol oynamış; yaşam və davranış tərzi ilə daim şüurlu insanı heyrətləndirmiş, düşündürmüş, halallığa, təmizliyə, intizama, qənaətçilliyə və yaradıcılığa sövq etmiş; məhsullarının möcüzəvi müalicə xüsusiyyətləri, müqayisəolunmaz qidalılığı və çoxçeşidliliyi baxımdan alternativsizliyi ilə seçilmişdir.

Təbiətin yaratdığı milyonlarla canlılar arasında insanların daha çox marağını və diqqətini çəkən, öyrənilən; bununla belə sirləri ilə insan ağlını və elmini aciz vəziyyətdə qoyan canlılardan biri və bəlkə də birincisinin bal arısı olduğunu desək yanılmarıq.

Bal arılarının davranışları sahəsində apardığı tədqiqatlara görə 1973-cü ildə Nobel mükafatı almış Karl Frişin arı haqqında dedikləri arı aləminin sirlərinin bu böyük alim üçün də tam açılmadığını təsdiq edir: "Arı aləmi sirli quyuya bənzər. Ondan nə qədər çox götürsən bir o qədər çox dolur".

Bal arısı məhsullarının əvəz olunmaz qidalılığı, müalicəvi xüsusiyyətləri, eləcə də bal arısının ətraf mühitin qorunması, ekoloji tarazlığın bərpası istiqamətlərindəki müqayisə olunmaz potensial imkanları ilə bərabər, onun entomofil kənd təsərrüfatı bitkilərinin tozlandırılmasında və ya başqa sözlə desək dünya əhalisinin ərzaq təminatındakı rolu da olduqca böyükdür.

Almaniya və ABŞ universitetləri alimlərinin apardığı tədqiqatların nəticələrinə görə 115 adda kənd təsərrüfatı bitkisinin bal arısı ilə tozlandırılması olmadan normal məsul verməsi mümkün deyildir.

Dünyanın 200 Ölkəsində istehsal olunan ərzaq məhsullarının 30%-i həşarat tozlandırması nəticəsində mümkün olur. Alman və Fransız mütəxəssislərinin hesablamalarına görə tozlandırma hesabına dünyada istehsal olunan ərzaq məhsullarının ümumi dəyəri 153 milyard yevro miqdarındadır ki, bunun da 50 milyardı tərəvəz, 50 milyardı meyvə, 39 milyardı yağlı bitkilər və qalan 14 milyardı isə digər bitkilərin payına düşür.

Bal arısı ilə bitkilərin tozlandırılmasından əldə olunan məhsul artımının dəyəri ABŞ-da 14,5 milyard, Kanadada 1,5 milyard, İngiltərədə isə 800 milyon funt sterlinq miqdarında hesablanmışdır.

Son illərdə təbiətdə baş verən qlobal iqlim dəyişmələri, müxtəlif istiqamətli və miqyaslı antropogen fəaliyyətlərin mənfi təsirləri bal anlarının yem ehtiyatlarının tükənməsi və keyfiyyətinin aşağı düşməsi, gen ehtiyatlarının ciddi çirklənməsi, xəstəliklərin genişlənməsi və yeni təhlükəli xəstəliklərin meydana gəlməsi, arı ailəbrinin sayının sürətlə azalması, məhsuldarlığın və alınan məhsulların keyfiyyətinin aşağı düşməsi kimi ciddi fəsadlarla özünü büruzə verməkdədir.

Artıq daha çox sənayeləşmiş və urbanizasiyalaşmış bir çox ölkələrin mövcud iqlim şəraitləri bal arılarının normal yaşamını təmin edə bilmədiyindən, bu ölkələr bal arılarının kütləvi qırğını sindromu deyilən olduqca təhlükəli problemlə qarşılaşmışlar.

Dünya ölkələrinin arıçılar birliklərinin beynəlxalq federasiyası - Apimondiyanın məlumatlarına görə 2008-ci ildə Avropa Birliyi ölkələrində saxlanılan 13,6 mln arı ailəsinin 30%-i məhv olmuşdur. Alimlərin hesablamalarına görə itkilərin belə yüksək səviyyəsi davamlı olarsa, 8-10 il ərzində Avropa arıçılığı tamamilə məhv ola bilər. Arı ailələrinin kütləvi qırğını sindromu özünü 2008-ci ildə ABŞ-da 40%, Kanadada 28% səviyyəsində göstərmişdir. Yaponiya kənd təsərrüfatı nazirliyinin məlumatlarına görə isə sindromun 2008-ci il nəticələri növbəti ildə də təkrarlanarsa, ölkə arıçılığı əsaslı şəkildə tənəzzülə uğrayacaq.

Sindromun qorxunc nəticələri artıq arıçılar və arıçı alimlərlə yanaşı bir çox dövlətləri, nəhəng aqrobiznes və qida sənayesi kompaniyalarını da narahat etməyə başlamışdır. Belə ki, bal arılarının və digər tozlayıcıların sayının bu şəkildə azalmasının məntiqi sonu dünyada bir çox ərzaq məhsullarının istehsalının kəskin azalması və qiymətlərinin artımı, sosial-iqtisadi problemlərin gərginləşməsi və ciddi ekoloji fəlakətlər deməkdir.

Böyük alim Albert Eynşteyn əbəs yerə deməmişdir: "Arının məhvindən dörd il sonra yer kürrəsində insan həyatı məhvə məhkumdur".

Arı ailələrinin kütləvi qırğını sindromunun təhlükəliliyi nəzərə alınaraq, onun yaranma səbəbləri və qarşısının alınması üçün bir çox dünya ölkələrində (ABŞ, İngiltərə, Almaniya, Türkiyə, Fransa, Yaponiya və s.) ciddi tədqiqatlar aparılır və bu tədqiqatların miqyaslı maliyyə təminatı təmin edilir.

Problem Apimondiyanın 2007 və 2009-cu ildə keçirilmiş hər iki konqressində ciddi müzakirə olunmuş, aparılmalı tədqiqat istiqamətləri dəqiqləşdirilmiş və dünya təşkilatlarına müraciətlər qəbul edilmişdir.

Artıq bal arısının mühafizəsinə BMT də qoşulmuş və onun iki ixtisaslaşmış idarəsi: Ətraf mühit (UNEP) və Ərzaq və kənd təsərrüfatı (FAO) tərəfindən 25 mln dollarlıq, beş illik layihənin həyata keçirilməsinə başlanılmışdır.

Paralel olaraq dünyanın 39 ölkəsindən 125 alimin iştirakı ilə yeni bir layihənin də həyata keçirilməsinə başlanılmışdır və bu layihənin əsas məqsədi arı biologiyası və xəstəlikləri sahəsində çalışan mütəxəssislərin işgüzar əlaqələrinin və əməkdağlığının təmin edilməsidir.

İki il ərzində aparılmış tədqiqatların ilkin nəticələrinə görə arıların kütləvi qırılmasının səbəbləri aşağıdakılardır:

-Pestisid və arı müalicəsində istifadə olunan dərman preparatları qalıqlarının güləmdə toplanmasının mənfi təsirləri;

-Virus xəstəliklərinin geniş yayılması və yeni virus xəstəliklərinin yaranması; -Kənd təsərrüfatı əkinləri sahələrinin sürətli artımı və meşələrin məhvi ilə əlaqədar təbii yem ehtiyatlarının azalması və yoxsullaşması; -Genləri dəyişdirilmiş kənd təsərrüfatı bitkilərinin təsirləri;

-Arıların immun sistemini tamamilə məhv edən və ya immun çatışmamazlıqlarına səbəb olan yeni göbələk və digər təhlükəli xəstəliklərin artması;

-Kosmik radionaviqasiya və mobil telefon rabitəsində yaranan elektromaqnit dalğalarının arılara mənfi təsirləri.

Tədqiqatçılar bal arısının kütləvi qırğını sindromunda yuxarıdakı faktorlardan hansı isə birinə üstünlük vermir, onun çoxfaktorlu səbəblərdən yarandığına diqqət çəkirlər.

Hələlik yekun qənaət ondan ibarətdir ki, bu faktorlardan hər birinin sindromun baş verməsində müəyyən qatqısı var və bal arısının etibarlı mühafizəsi bütün faktorları əhatə edən, elmi əsaslara söykənən, uzun müddətli kompleks tədbirlərlə mümkündür. Artıq bütün dünya bal arısının varlığını təhdid edən bu təhlükənin qarşısının alınması üçün miqyaslı layihələrə başlamış, başqa sözlə desək bal arısının mühafizəsinə qalxmışdır.

Ölkəmizdə bal arısının mühafizəsi istiqamətində görülmüş və görülməli tədbirlər barədə cəmiyyətin bilgiləndirilməsi faydalı olardı.

Bal arısının küdəvi qırğını sindromunu şərtləndirən faktorların Azərbaycan ərazisində də arılara təsiri mövcuddur. Lakin zəruri tədqiqatlar aparılmadığından bu təsirlərin təhlükəlilik dərəcəsi, yayılma coğrafiyası, hansı dinamika ilə inkişaf etməsi barədə dəqiq məlumatlar yoxdur.

Ölkəmizdə yerli arı genofondunun qorunması və damazlıq işi, arıçılıqda yem ehtiyatı bazasının yaxşılaşdırılması, arıçılıq məhsullarının yüksək səviyyəli istehsalı, tədarükü və qablaşdırılması kimi həlledici məsələlərə uzun illər göstərilən biganəlik bal arısının mühafizəsinin və ondan səmərəli istifadənin nə qədər acınacaqlı vəziyyətdə olmasından xəbər verir.

Bununla belə son üç-dörd ildə ölkəmizdə arıçılıq sahəsində canlanma müşahidə olunmaqdadır. Ölkə ərazisində xarici təşkilatların yardımı ilə bir neçə arıçılıq layihələrinin həyata keçirilməsi, yüksək səviyyədə olmasa da, müntəzəm olaraq arıçılıq sərgilərinin təşkili, arıçıların təşkilatlanmasını qarşısına hədəf qoymuş Azərbaycan Arıçılar İttifaqının yaradılması və ən mühümü olan "Arıçılıq haqqında" qanunun 2009-cu ildə ölkə başçısının verdiyi fərmanla qüvvəyə minməsidir.

"Arıçılıq haqqında" qanunda arıçılıqda zəruri inkişafın təmin edilməsi, rəqabət qabiliyyətli və gəlirli sahəyə çevrilməsi, mövcud mütərəqqi arıçılıq təcrübələri və texnologiyalarının ölkəmizdə tətbiqi, arıçılıqda kadr təminatı, damazlıq işinin yaxşılaşdırılması, qiymətli yerli arı genofondumuzun qorunub

saxlanması, arıçılıq məhsullarının istehsalının artırılması və istifadəsinin genişləndirilməsini təmin edən ciddi müddəalar vardır. Qanunun dörd maddədən ibarət olan beşinci fəsli tamamən bal arısının mühafizəsinə həsr olunmuşdur.

Qanunda nəzərdə tutulan tələblərə ciddi əməl olunarsa, qısa müddətdə ölkə arıçılığında və bal arısının mühafizəsi sahəsində ciddi inkişafa nail olunacaqdır.

Bunun üçün ilk növbədə yerli arı genofondunun qorunması, arıçılıqda damazlıq və ana arı yetidiriciliyi işinin müasir dövrün tələblərinə uyğun qurulmasına nail olmaqdır. 2009-cu ildə "Dağ arıçıları" İçtimai Birliyinin arıçıları qardaş Türkiyənin TİKA təşkilatının texniki dəsdəyi ilə Xızı rayonu ərazisində izolə mayalandırma məntəqəsi təşkil etməklə, illik məhsuldarlığı 3 000 ədəd olan ana arı yetişdiriciliyi təsərrüfatı yaratmışlar. Təsərrüfatda istehsal olunan yüksək keyfiyyətli və cins təmizliyinə nail olunmuş ana arılar "Arıçılıq haqqında" qanunun tələblərinə uyğun olaraq respublikanın bütün bölgələrinə paylanmaqdadır.

Təsərrüfatın genişləndirilərək illik məhsuldarlığın 6 000 ədədə çatdırılması, onun damazlıq işi və ana arı yetişdiricilərinin hazırlanması mərkəzinə çevrilməsi ölkə arıçılığına ciddi fayda verərdi. Əlavə olaraq regionlarda bir neçə belə təsərrüfatın yaradılmasına da ehtiyyac vardır.

Azərbaycan arıçılığının həllini gözləyən əsas problemlərdən biri də arıçılıq məhsullarının avropa standartlarına uyğun istehsalı, tədarükü, emalı, qablaşdırılmasına nail olmaqdır.

Azərbaycan Arıçılar İttifaqı arıçılarımızın bu əsas probleminin köklü şəkildə həlli üçün dəyəri 1,1 mln. manat, illik istehsal məhsuldarlığı: 1000 ton bal, o cümlədən 400 t ixrac təyinatlı, 4 t çiçək tozu, 0,5 t barəmum (propolis) və 250 kq arı südü olan "Arıçılıq məhsullarının Avropa standartlarına uyğun emalı, qablaşdırılması və marketinqi" adlı layihə hazırlamışdır.

Layihənin həyata keçirilməsi ölkəmizdə arıçılıq məhsullarının istehsal həcminin və mədəniyyətinin yüksəlməsinə, hazırda böyük vüsət almış və hərtərəfli ziyanlı olan bal adı altında saxta məhsulların satışının qarşısının alınmasına və həm də bal arısının mühafizəsinə xidmət edəcək.

Son illərdə təbiətdə baş verən qlobal iqlim dəyişmələrinin və urbanizasion xarakterli insan fəaliyyətinin mənfi təsirləri; əkin, suvarma, otarma normalarına düzgün əməl olunmaması və meşələrin qırılması ilə erozion proseslərin sürətlənməsi arıçılığın yem ehtiyatlarına mənfi təsirini göstərməkdədir.

Təcrübə göstərir ki, ildən-ilə ölkənin arıçılıq üzrə mövcud yem ehtiyatı potensialı sürətlə azalır və bu da arıçılıqda məhsuldarlığın azalmasına, stabil arıçılıq məhsulları istehsalının mümkünsüzlüyünə və sonda arıçılıq sahəsinə olan marağın itirilməsinə gətirir.

Yaranmış bu problemin həlli yollarından biri arıçıların özlərini cəlb etməklə ölkənin hər yerində nektar və çiçək tozu (polen) verən bitkilərin kütləvi əkinləri üçün təminat yaradan layihələrin həyata keçirilməsidir. Ölkədə yem

ehtiyatı bazasının yaxşılaşdırılması bal arısının mühafizəsini asanlaşdıracaq əsas amillərdən biri ola bilər.

Ölkədə arı xəstəlikləri ilə mübarizənin aşağı səviyyədə olması, arı xəstəliklərinə qarşı planlı, əhatəli və müntəzəm tədbirlərin aparılmaması təhlükəli arı xəstəliklərinin kütləvi yayılmasına və bal arısının mühafizəsinin xeyli çətinləşməsinə səbəb olur. Arıçılıq məhsullarında qalıntı verməyən və orqanik mənşəli dərman preparatlarından istifadə edilməli və dərmanların əsasən kek (kandi) şəkündə arılara verilməsi üsuluna keçid təmin olunmalıdır.

Bal arısının mühafizəsini xeyli asanlaşdıran tədbirlərdən biri də ölkədə arıçılıq təsərrüfatları və arı ailələrinin vahid bir sistemdə qeyd altına alınmasıdır. Arıçılığı inkişaf etmiş ölkələrdə bu məsələ Kənd təsərrüfatı nazirliyi və arıçılar birliklərinin birgə əməkdaşlığı ilə həyata keçirilən layihələrlə uğurla həll olunmuşdur. Azərbaycan Arıçılar İttifaqı xarici təcrübəyə istinad etməklə, ölkə arıçılığının vahid qeyd sisteminə keçilməsini təmin edən layihə hazırlamışdır. Bu layihənin həyata keçməsində maraqlı olan bütün tərəfləri əməkdaşlığa dəvət edir.

*Elm tariximizdən*

# AZƏRBAYCAN VƏ DÜNYA AQRAR ELMİNİN İNKİŞAF TARİXİNDƏ AKADEMİK ƏYYUB BƏŞİROV YARADCILIĞININ ROLU VƏ ƏHƏMİYYƏTİ

**Musa MUSAYEV**, *Zoologiya İnstitutunun direktoru, AMEA-nın həqiqi üzvü, akademik*
**Əfqan MƏMMƏDOV**

Kənd təsərrüfatının inkişaf etdirilməsi, məhsul istehsalının artırılması, əhalinin ekoloji təmiz, bioloji qiymətli ərzaqla, sənayenin isə xammalla təmin olunması həlli vacib bir problem kimi bütün dövrlərdə, bütün cəmiyyətlərdə öz ciddiliyi, kəskinliyi, zəruriliyi ilə xüsusi diqqət çəkib, gündəlikdə dayanıb. Çünki bir fərd olaraq insanın yaşayışı, gündəlik həyatı, məişəti, sağlamlığı, bütövlükdə isə həmin fərdlərdən ibarət cəmiyyətin özünün varlığı, tərəqqisi bir çox amillərlə aqrar sahə ilə sıx bağlıdır. Deməli, aqrar sahəni inkişaf etdirmədən cəmiyyətin normal həyatından, onun varlığından söz açmaq mümkün deyil.

Çoxdan bəlli olan bu aksioma insanı haqqında bəhs etdiyimiz problemin həllinə yönəlmiş axtarışlara, elmi tədqiqatlara, elmi araşdırmalara məcbur etmiş, nəticədə aqrar elmin inkişafının nüvəsinə, təkanverici qüvvəsinə çevrilmişdir.

Elə, indi də belədir. Axı, müasirlik, müasir dövr sindromu inkişaf tələb edir. Tələbat isə təbii ki, həmişə eyni səviyyədə qalmır, artır. Bu gün ən nüfuzlu beynəlxalq siyasi, elmi təşkilatlar dünya əhalisinin ərzaq təminatının ödənilməsi, ərzaq təhlükəsizliyinin yaradılması istiqamətindəki qlobal məsələlərin, araşdırmaların, elmi tədqiqatların, elmi layihələrin üzərində baş sındırır, ciddi-cəhdlə çalışır.

Çünki hələ də, bütövlükdə götürdükdə, dünyada kənd təsərrüfatının istehsal gücü əhalinin tələbatının ödənilməsinə çatmır.

Ərzaq təhlükəsizliyi probleminin tam həlli hələ də açıq qalır. Bunu inkişaf etməmiş ölkələrin timsalında daha aydın görmək olar.

Belə qlobal problemlərin çözülməsində təbii ki, aqrar elmin də üzərinə məsuliyyət, ağırlıq düşür və onun potensialına böyük ehtiyac duyulur.

Bax, elə hörmətli oxucularımıza təqdim olunan yeni kitabın, akademik Əyyub Bəşirovun "Azərbaycanda biologiya elminin və heyvandarlığın inkişaf tarixindən" adlı əsərinin yazılması, nəşr olunması da məhz həmin ehtiyacdan, zərurətdən, bir sözlə, dövrün tələbindən irəli gəlir.

Kitab əlli ildən çox bir dövr ərzində Azərbaycanda biologiya elminin və heyvandarlığın inkişafı istiqamətində aparılan elmi araşdırmaların, elmi tədqiqatların, müşahidələrin məcmudur. Kitabdakı bütün fikirlər, dəlillər, qənaətlər,

müddəalar, faktlar, rəqəmlər kənd təsərrüfatının əsas istiqamətlərindən olan heyvandarlığın inkişafına, məhsul istehsalının artırılmasına, sahənin məhsuldarlığının yüksəldilməsinə, heyvanların cins tərkibinin yaxşılaşdırılmasına, heyvanların balavermə və balasın yaşama qabiliyyətlərinin yüksəldilməsinə, insanların yüksək keyiyyətli, ekoloji təmiz, bioloji qiymətli, yüksək qidalılığa, müalicəvi əhəmiyyətə malik, dietik heyvandarlıq məhsulları ilə təmin olunmasına və s. bu kimi çoxsaylı məsələlərin həllinə yönəlib və eyni zamanda həlli yolları da göstərilib.

Kitab haqqında geniş danışmamışdan öncə bir məqam üzərində dayanmaq istərdik. Əvvəla, onu qeyd edək ki, akademik Əyyub Bəşirovun elmi yaradıcılığı çox geniş, çoxşaxəlidir. Alimimizin yaradıcılığının coğrafiyası isə olduqca böyük bir ərazini, Cənubi Amerika, Şimali Afrika, Avropa və Asiya ölkələrini əhatə edir.

İstər hörmətli akademikimizin yaradıcılığı, istərsə də bütövlükdə Azərbaycan aqrar elmi dünya aqrar elminin olduqca zəngin, çox dəyərli, özünəməxsus səhifələrindən, mühüm tərkib hissələrindəndir. Onları bir-birindən ayrı təsəvvür etmək mümkün deyil.

Elə bu səbəbdən də belə fikrə gəlmək olar ki, Əyyub Bəşirovun təkcə bir kitabından danışmaq, ümumən, onun yaradıcılığı haqqında heç nə deməməyə bərabərdir.

Bu səbəbdən də istərdik ki, kitab haqqında söz açmamışdan öncə alimin yaradıcılığından, bu zəngin elmi irsin əhəmiyyətindən, aqrar elm tarixindəki mövqeyindən, onun da nümayəndəsi, yaradıcılarından biri olduğu Azərbaycan aqrar elminin dünya elmindəki yerindən bəhs edək. Həm də almin həyat və fəaliyyətinin bir çox məqamları üzərində dayanaq.

Məhz bu nöqtədən, bu məqamdan sonra oxuculara təqdim olunan kitaba işıq salmaq daha məqsədə uyğun olardı.

Xalqımız dünya mədəniyyətinin, elmi fikrinin inkişafında müstəsna xidmətlər göstərmiş böyük zəka sahibləri, elm-mədəniyyət xadimləri, yaradıcılıqları epoxalara, vaxt, zaman adlı məfhumlara sığmayan, çox işıqlı simalar yetişdirmişdir. Bu simalardan təkcə bir neçəsinin adını çəksək, bəşər mədəniyyətinə xalqımızın nələrin verdiyini aydın görmək olar. Xaqani, Nizami, Tusi, Hacı Zeynalabdin Şirvani, Şəhriyar, Lütfizadə, Yusif Məmmədəliyev, Üzeyir Hacıbəyov, Heydər Hüseynov, Hüseyn Cavid, Qara Qarayev, Səttar Bəhlulzadə...

Bu mənada aqrar elm də istisna deyil. Azərbaycan aqrar elmi çox zəngin inkişaf tarixinə malikdir və bu tarix dünya elm tarixinin ən dəyərli, ən maraqlı səhifələrindəndir. Bu səhifəni isə akademiklər -- Firuz Məlikov, Məmmədtağı Qəniyev, Mirzə Sadıqov, İmam Mustafayev, Cəlal Əliyev, Raul Qədimov, Nəriman Şirinov, Məmmədtağı Cəfərov, professorlar -- Ağaxan Ağabəyli, Zülfüqar Verdiyev, Eyyub İsgəndərov, Bala Ağayev, Rəhim Səttarzadə, Rəhim Hüseynov, Cahangir Axundov, Əli Əliyev, Müseyib Əliyev, İkram Eyyubov, Elxan Əliyev, Qəzənfər Quliyev, Arif İsmayılov, Bəhram Əliyev, Əsəd Musayev, Kamal Ağalarov, Abdulla Həşimov kimi yüzlərlə elm xadimləri öz yaradıcılıqları ilə zənginləşdirmişlər.

Xüsusən də XX əsrdə adlarını sadaladıqlarımız və sadalaya bilmədiklərimiz elm xadimlərinin sayəsində Azərbaycan aqrar elmi özünün ən yüksək inkişaf zirvəsinə çatdı. Azərbaycan aqrar elmi özünün formalaşmış elmi ənənələri, elmi məktəbləri ilə təkcə keçmiş İttifaqda deyil, dünyanın elmi təşkilatları, elmi ictimaiyyəti tərəfindən rəğbətlə qarşılandı, təqdir olundu. Dünya aqrar elmi, biologiya elmi nəzəriyyələri və təcrübələrində "Firuz Məlikov elmi məktəbi", "Bəşirov metodu" kimi elmi terminlər beynəlxalq səviyyədə qəbul edildi, işlədilməyə başlandı.

Beynəlxalq elmi ictimaiyyət tərəfindən qəbul edilmiş bu terminlərin özü Azərbaycan aqrar elminin dünya miqyasındakı çəkisindən, nüfuzundan, əhəmiyyətindən, mövqeyindən xəbər verirdi.

Bu baxımdan biologiya elmləri doktoru, Rusiya Beynəlxalq Keyfiyyət Problemləri Akademiyasının həqiqi üzvü, akademik Əyyub Balaməmməd oğlu Bəşirovun elmi yaradıcılığı mühüm əhəmiyyət kəsb edir.

Alimimizin yaradıcılığı, həyat və fəaliyyəti, elmi yaradıcılığı, elmi-mənəvi fikirləri, ictimai-siyasi baxışları bütövlükdə insanın, onun üzvü olduğu cəmiyyətin tərəqqisinə, sağlamlığına, ekoloji və ərzaq təhlükəsizliklərinin təminatına, daha dəqiq desək, ekoloji təmiz, bioloji qiymətli, müxtəlif çeşidli ərzaqla, heyvandarlıq məhsulları ilə təmin olunmasına, qiymətli, yerli genefondların qorunmasına, saxlanılmasına, onlardan səmərəli istifadə olunmasına, yüksək məhsuldar yeni cinslərin yaradılmasına, məhsul istehsalının və keyfiyyətinin yüksəldilməsinə yönəlib.

Əyyub Bəşirovun elmi irsinin mahiyyəti, elmi yaradıcılığının məqsədi, qayəsi təbiətin, ekologiyanın təmizliyi və qorunub saxlanılması, millətimizin, xalqımızın, bütövlükdə, bəşəriyyətin sağlamlığı, firavanlığı, xoşbəxtliyidir.

Alim bu məqsədə çatmağın yollarını hər bir əsərində, tədqiqatlarında, müşahidələrində araşdırır, axtarır, arayır, nəticədə də tapır. Təkcə bir faktı gətirməklə sözümüzə qüvvət vermiş olarıq. Əyyub Bəşirov heyvanların törəyib çoxalması biologiyasının öyrənilməsində fundamental tədqiqatlar aparıb və sanballı elmi nəticələr əldə edib.

Yuxarıda adını çəkdiyimiz "Bəşirov metodu" məhz həmin fundamental tədqiqatların elmi nəticəsidir. Nədir bu "Bəşirov metodu"?

Kənd təsərrüfatı heyvanlarının çoxaldılmasına, bunların cins tərkibinin yaxşılaşdırılmasına, sağlam nəsil alınmasına, məhsuldarlığın min dəfəyə qədər artırılmasına və s. kimi çox mühüm, böyük nəticələr əldə etməyə imkan verən bir metoddur.

Əyyub Bəşirov cərrahi yolla erkək heyvanların çoxalma üzvünü 30-35-45 dərəcə bucaq altında öz təbii yerindən kənara çəkməklə süni mayalamada istifadə etmək üçün yüksək keyfiyyətli toxum alınmasına, törədici-seçici-stimuleedici kimi istifadə edilməsinə, bununla da bir çox problemlərin aradan qaldırılmasına nail oldu. Əgər adi, təbii cütləşmədə naxırda bir ildə bir törədici ilə ən yaxşı halda ən çoxu 20-25 inək mayalamaq mümkün olursa, süni mayalanmada isə qısa müddətdə saxlanılan toxumla mayalandırıldıqda 2000-2500, Bəşirov metodunu və texnologiyalarını tətbiq etdikdə (dondurulmuş toxumla mayalandırdıqda) 20-

25 min camış və inək mayalamaq mümkündür. Bir az əvvəl qeyd etdiyimiz min dəfəlik artım da, bax, burdan irəli gəlir. Bu nəticə elmdə, təcrübədə inqilab deyilmi?! XX yüz illiyin ortalarında işlənib hazırlanmış bu orijinal, mütərəqqi metod bu gün də dünyanın heyvandarlıq təcrübəsində, dünya ölkələrində geniş istifadə edilir və çox böyük uğur da gətirir.

Alimimizin yaradıcılığında belə nəticələrin, belə faktların sayı isə olduqca çoxdur.

Əyyub Bəşirov 1926-cı il dekabrın 20-də Neftçala rayonunun Xolqarabucaq kəndində anadan olub.

Atası Balaməmməd kişi ailəsini halal zəhmətlə, heyvandarlıqla, əkinçiliklə, balıqçılıqla məşğul olmaqla dolandırırdı.

Əhalinin dolanışığında heyvandarlığın xüsusi çəkisi həmişə böyük olub. Balaməmməd kişi də təsərrüfat adamı kimi qoyun-quzu da saxlayırdı, camış da, inək də. Bərəkət dolu süfrəsində yağ-yavanlıq həmişə bol olardı. Xüsusən də camış qatığı, camış südü, camış yağı.

Təbii ki, bu bərəkətin mənbəyi Ulu Tanrıya bağlılıq, çəkilən zəhmət, axıdılan alın təri idi. Balaməmməd kişi ailədə böyüyən uşaqları lap erkən yaşlarından zəhmətə alışdırdı. Çalışdı ki, övladları halal çörək qazanmağın yolunu torpağa bağlılıqda, zəhmətdə görsünlər.

Bu halallıq elə nəslin özündən gəlirdi. Balaməmməd kişinin ata-babaları əslən Şamaxıdandır. Ulu babaları Hacı Səməd din xadimi və Şamaxının qazısı olub. Məlum Şamaxı zəlzələsindən sonra Hacı Səməd qohum-qardaşı köçüb Xolqarabucaqda məskunlaşıblar.

Digər aran bölgəsində olduğu kimi, Salyanda, Neftçalada da qoyunçuluq və maldarlıqla məşğul olurlar. Lakin əhali camışçılığa, balıqçılığa daha üstünlük verir. Bu da təbii şəraitdən irəli gəlir. Kür bu bölgələrdən ötüb Xəzərə tökülür. Akkuşa kimi xırda çaylar da burda Kürə qovuşur. Çəkilmiş kanallar, arxlar boyu, təbii qoruqlardakı qamışlıqlar, bol su ehtiyatı camışçılığa münbit şərait yaradır. Əhali də bu imkanlardan geniş bəhrələnir.

Yeri gəlmişkən onu da qeyd edək ki, əvvəllər (1859-1900-cu illərdə) Xolqarabucaq kəndi Camışçılar adlanırdı.

Belə münbit şəraitdə camışçılıq bu bölgədə əsas təsərrüfat sahəsi kimi inkişaf tapır. Bölgədə bu əsas zəmin üzərində də istər seleksiya, damazlıq, istərsə də bəsləmə, məhsul istehsalı baxımından özünəməxsus ənənələr yaranmışdı. Bir kənd təsərrüfatı heyvanı kimi camış bölgədə kəndli həyatının, kəndli məişətinin atributuna çevrilmişdi. Elə indi də belədir.

Təbii ki, belə bir mühitdə, belə bir şəraitdə, çörəyini halal zəhmətdən çıxaran ailədə böyüyən uşağın da təfəkkürü bu istiqamətdə formalaşacaqdı. Başqa cür necə ola bilərdi ki?!

Kür, Akkuşa çaylarının kənarındakı çəmənliklər, gen düzlər, bağ-bağatlardakı ağaclar, çiçəklər, güllər balaca Əyyubu riqqətə gətirirdi. Quzuları otardıqca bu güllərdən yığıb dəstə bağlar, nənəsinə gətirərdi. Sədəf nənə də hər otun, hər çiçəyin, hər gülün adını deyər, bir-bir hamısını uşağa tanıtdırar, otlar, çiçəklər barədə müxtəlif rəvayətlər, nağıllar danışar, həm də bəzilərinin nəyə xeyirli olduqlarını da deyərdi.

Hər dəfə quzu nobatından qayıdan nəvəsinə həmin otlardan dəmlədiyi çaydan verərdi ki, yorğunluğu tez çıxsın. Hər gün nənə nəvəsiynən çay içə-içə söhbətləşər, ona dediyi nağıllarla, dastanlarla doğma torpağa, yurda məhəbbət, elmə, biliyə, təhsilə həvəs aşılayardı.

1933-cü ildə Əyyub Beşirov əmisi Məşədi Mirzə Heybət kişinin Xolqarabucaqda 1928-29-cu ildə açdığı orta məktəbin birinci sinfinə gedir. 1942-ci ildə isə həmin məktəbin 9-cu sinfini bitirir.

Əyyub müəllimin erkən gənclik illərinin ağır müharibə illərinə düşməsi təhsilini sürəkli davam etməsinə mane olur. O, atasının rəhbərlik etdiyi fermada müharibəyə getmiş çobanları əvəz edir. 1941-1943-cü illərdə İ.V.Stalin adına kolxozda çoban işləyir. 1943-cü ildə Salyan şəhərindəki Pedaqoji Texnikumda qiyabi təhsil alır. Elə həmin ildən 1945-ci ilin sentyabrınadək Xoltəzəkənd və Xolqarabucaq kənd məktəblərində müəllimlik edir.

Əyyub Bəşirov 1945-ci ildə Azərbaycan Kənd Təsərrüfatı İnstitutunun zootexnika fakültəsinin birinci kursuna qəbul edilir. 1947-ci ildə ikinci kursu uğurla başa vurduqdan sonra Əyyub Bəşirov əlaçı tələbə kimi K.A.Timiryazev adına Moskva Kənd Təsərrüfatı Akademiyasının zootexnika fakültəsinin üçüncü kursuna köçürülür.

Bu ali təhsil ocağının Əyyub Bəşirovun dünyagörüşünün formalaşmasında, elmi baxışlarının itiləşməsində, elmə, elmi tədqiqatlara marağının artmasında misilsiz rolu oldu. Qaynar tələbəlik həyatı onun elmi fəaliyyətinə böyük təkan verir. Əyyub Bəşirov elmi dərnəklərdə, tələbə elmi cəmiyyətində fəal iştirakçıya çevrilir. Akademiyanın iribuynuzlu heyvanlar, atçılıq və yemləmə kafedralarında təşkil edilmiş dərnəyin heç bir tədbirindən qalmırdı. O, burada elmi məruzələri, öz tədqiqatları, araşdırmaları ilə diqqəti cəlb edərək özünü perspektivli tələbə kimi göstərir. Akademiklər Nikolayev, Liskun, Popov, professorlar Vitt, Kislovski kimi müəllimlərin, dünya şöhrətli alimlərin böyük rəğbətini qazanır.

1950-ci ildə K.A.Timiryazyev Akademiyasını uğurla bitirib alim-zootexnik adı alır və təyinatla Azərbaycan Elmi-Tədqiqat Heyvandarlıq İnstitutuna işə göndərilir. O, burada 1950-ci il aprel ayının 27-dən noyabrın 30-dək qoyunçuluq şöbəsində kiçik elmi işçi kimi çalışır.

Hələ K.A.Timiryazyev adına Akademiyada oxuyarkən Əyyub Bəşirovun elmi-tədqiqat işlərinə, elmi həvəsini görən və ona böyük ümid bəsləyən akademik Firuz Məlikov gənc tələbə ilə müntəzəm məktublaşır, lazımi tövsiyələrini, məsləhətlərini verirdi.

Akademiyanı bitirən kimi də akademik Firuz Məlikov və professor Ağaxan Ağabəyli onu Azərbaycan Elmi Tədqiqat Heyvandarlıq İnstitutunun qoyunçuluq şöbəsinə kiçik işçi vəzifəsinə işə dəvət edirlər.

Əllinci illərin əvvəllərində həmin institutda, məhz həmin şöbədə, nəinki Azərbaycan, ümumən, Qafqaz xalqlarının heyvandarlıq, daha doğrusu, qoyunçuluq tarixində yeni səhifə açıldı.

Akademik Firuz Məlikovun rəhbərliyi və metodikası əsasında yeni, yağlı quyruqlu, yarım zərif, yarım qaba yunlu yeni qoyun cinslərinin yaradılmasına başlanmışdı.

Əyyub Beşirov da bu böyük elmi-tarixi səhifənin başlanğıcından onun iştirakçısı, yaradıcılarından biri oldu. O, kiçik elmi işçi kimi həmin mövzunun icraçısı idi.

1950-ci ilin dekabrından Əyyub Beşirovun həyatında yeni bir mərhələ başlayır. O, Moskvada Ümumittifaq Heyvandarlıq İnstitutunun aspiranturasına daxil olur. 1951-ci ildən 1954-cü ilin fevralınadək əlaçı aspirant kimi burada oxuyur. Sovet dövrünün ən görkəmli alimlərindən biri Viktor Konstantınoviç Milovanovun rəhbərliyi altında "Azərbaycan camışının çoxaldılması biologiyasının məsələləri" (Voprosı bioloqii razmnojenie buyvolov Azerbaydjana) mövzusunda namizədlik dissertasiyasını yazır.

1954-cü ilin noyabrında dissertasiyanı uğurla müdafiə edib biologiya elmləri namizədi elmi dərəcəsini alır.

Bu uğurdan sonra gənc alimin qarşısında yeni üfüqlər açılır. Əyyub Beşirov böyük coşqu ilə elmi fəaliyyətə başlayır. O, Respublika Kənd Təsərrüfatı Nazirliyi sistemindəki müxtəlif elmi qurumlarda müxtəlif vəzifələrdə çalışır.

1954-cü ilin fevralından 1955-ci ilin aprelinədək Azərbaycan Elmi-Tədqiqat Heyvandarlıq İnstitutunda elmi işçi, sonra Kür-Araz (Sabirabad) təcrübə stansiyasının direktoru işləyir. 1954-cü ildə Kür-Araz təcrübə stansiyasında 1956-cı ilin sentyabrında isə institutda kənd təsərrüfatı heyvanlarının süni mayalandırılması laboratoriyasını təşkil edir və ilk müdiri təyin olunur. 1959-cu ildə isə daha böyük vəzifəyə, institutun elmi işlər üzrə direktor müavini vəzifəsinə irəli çəkilir. 1961-ci ildən isə Azərbaycan Elmi-Tədqiqat Heyvandarlıq İnstitutunun direktoru vəzifəsində çalışmağa başlayır. 1963-cü ildən isə elmi fəaliyyəti ilə bağlı (doktorluq dissertasiyasını yazmaq məqsədilə) öz xahişi ilə yenidən laboratoriya müdiri vəzifəsinə qayıdır.

Kənd təsərrüfatı heyvanlarının yetişdirilməsi və süni mayalandırılması laboratoriyasına qayıtmaqda məqsəd daha geniş və əhəmiyyətli elmi işlər aparmaq və yaradıcılıq işlərini davam etdirmək idi.

Əyyub müəllimin Azərbaycan Elmi-Tədqiqat Heyvandarlıq İnstitutunda və onun təcrübə stansiyasında müxtəlif vəzifələrdə çalışması dövrü onun yüksək elmi təşkilatçılıq fəaliyyəti ilə xarakterizə olunur. Belə ki, həmin dövrdə işlənib hazırlanmış metod və texnologiyaların, başqa alimlərin elmi nəticələri təsərrüfatlarda, damazlıq stansiyalarda istehsalata geniş tətbiq edilirdi.

Ötən əsrin əllinci, altmışıncı illəri Əyyub Beşirovun elmi yaradıcılığının ən məhsuldar dövrlərindəndir. Bu illərdə aparılan araşdırmaların, təcrübələrin istehsalata geniş tətbiqi yüksək nəticələrə gətirib çıxarırdı.

Mətbuatda, ayrı-ayrı dərgilərdə dərç olunan elmi məqalələri elmi ictimaiyyət tərəfindən maraqla qarşılanırdı.

"Muğanda yem bazasının yaxşılaşdırılması yolları", "Camışların qısırlığı ilə mübarizədə mühüm məsələ", "Kələ, buğa və qoç toxumlarının mühafizə olunma müddətinə və mayalandırıcı qabiliyyətinə antibiotiklərin, ağ stereptosidin təsiri", "Heyvan toxumunun saxlanması və daşınması texnologiyası və üsulları (toxumun dondurulması)", "Azərbaycanın aran yerlərində döllük qoçlardan səmərəli istifadə edilməsinə dair", "Camışçılıqda süni mayalanmanın tətbiqi", "Azərbaycan şəraitində inək və camışların döllənməsi, onlardan alınan balaların

yaşama qabiliyyətinin yüksəldilməsi üsulları", "Kəl və buğa törədicilərdən səmərəli istifadə edilməsinin əsas yolları", "Kənd təsərrüfatı heyvanlarını sınaqçı-törədici kimi hazırlamağın yeni üsulu" və s. kimi elmi məqalələr aqrar elmimizin incilərindən sayılır.

Onu da qeyd edək ki, alimin 800-dən çox elmi məqalələri var ki, bunların da yarıdan çoxu müxtəlif vaxtlarda dərc olunub, bir qismi çapa hazırlanır, digər qismi də hələ çap olunmamış qalır, daha doğrusu öz növbələrini gözləyir.

Əyyub Beşirovun 1959-1962-ci illərdə yazdığı "Qaramal" və "Kənd təsərrüfatı heyvanlarının süni mayalandırılması" adlı kitabları Azərbaycan dilində çap olunmuş sahəyə aid ilk dərsliklərdir. "Əlcəzairin heyvandarlığı" ("Jivotnovodstva Aljira". Moskva, 1976) monoqrafiyası qiymətli elmi mənbə kimi mütəxəssislər tərəfindən yüksək qiymətləndirilir.

Əyyub müəllimin qələminin məhsulları olan "Azərbaycanda damazlıq heyvanların biologiyası və yetişdirilməsi" 2005-ci ildə, "Azərbaycanda damazlıq heyvandarlığın problemləri və inkişafının elmi əsasları" 2008-ci ildə, "Fizioloqie reproduktivnoy funküii buüvolov Azerbaydjana" ("Azərbaycan camışının törəyib çoxalmasının fiziologiyası") kitabı da 2009-cu ildə çap olunub.

Ümumiyyətlə, alimin qələmindən çıxan əsərlərin hamısı qiymətli, həm də zəngin məxəz, elmi mənbə kimi həmişə müraciət olunur. Adlarını çəkdiyimiz və çəkə bilmədiyimiz əsərlərdə, xüsusən də süni mayalama ilə bağlı olan əsərlərdəki hər fikir, hər bənd elmə gətirilən bir yenilikdir.

İlk baxışda həmin bəndlər, əsərlərdəki həmin faktlar, rəqəmlər çox sadə görünür. Əslində isə bunların hamısı çox mürəkkəb, çox çətin iş proseslərinin, çox çətin analizlərin, çoxillik müşahidələrin nəticəsidir. Bütün o rəqəmlər, sübutlar, dəlillər yuxusuz gecələrin, narahat günlərin hesabına başa gəlib.

Əyyub Beşirov elmi yaradıcılığa ötən əsrin ortalarında, 1947-ci ildə başlayıb. Alimin yaradıcılığı şərti olaraq üç dövrə bölünür.

Birinci dövr -- Moskva dövrüdür. 1947-1954-cü illəri əhatə edir. Bu dövrə akademik K.A.Timiryazyev adına Moskva Kənd Təsərrüfatı Akademiyası və Ümumittifaq Heyvandarlıq İnstitutunun aspiranturasında oxuduğu illərdə yazılmış əsərlər, aparılmış elmi tədqiqatlar aiddir.

İkinci dövr -- Azərbaycan dövrü. Bu dövr 1950-ci ildən başlayır və bu günün özündə də davam edir.

Üçüncü dövr -- Xarici ölkələrdə elmi ezamiyyətlər dövrü.

Hindistan -- 1961-ci il (altı ay), İtaliya -- 1964-cü il, 6-25 sentyabr, Əlcəzair -- 1964-1966-cı, 1968-1970-ci illər, Çili -- 1971-ci il (noyabr, dekabr), Əfqanıstan -- 1981-1983-cü illər.

"Əlcəzairin heyvandarlığı", "Çilinin heyvandarlığı və Milli Birlik Hökuməti dövründə onun inkişaf perspektivləri", "Əfqanıstanın heyvandarlığı", "Hindistan və Bolqarıstanda camışçılıq" və "Yeni Bolqar mürrəhi camış cinsinin yaradılması" əsərləri bu dövrdə yazılıb.

Alimin heyvandarlığın sürətli inkişafına, ekoloji baxımdan təmiz, yüksək keyfiyyətli, bioloji qiymətli məhsul istehsalına, kənd təsərrüfatı heyvanlarının genefondunun sağlamlaşdırılmasına, cinsi, məhsuldarlıq və balavermə keyfiyyə-

tinin yaxşılaşdırılmasına, çoxaldılmasına, qorunub saxlanılmasına yönəlmiş elmi araşdırmalar, işləyib hazırladığı metod və texnologiyalar dünyada təqdir edilir, bəyənilir, tətbiq olunur.

Qeyd etdiyimiz kimi, Əyyub Beşirovun elmi yaradıcılığının ən mühüm cəhətlərindən biri də Azərbaycan xalqına məxsus qiymətli heyvan genefondlarının qorunub saxlanması, təkmilləşdirilməsi, çoxaldılıb yayılması və bunların da əsasında yeni yüksək məhsuldar, yerli şəraitə, xəstəliklərə davamlı cinslərin yaradılmasıdır. Alimin işləyib hazırladığı metod və texnologiyalar buna geniş imkanlar verir.

Lakin tarixin elə məqamları da olur ki, həmin vaxtlarda bu imkanlar da kifayət etmir, gərək sinəni də qabağa verəsən.

Ötən əsrin yetmişinci illərində, ümumən, heyvandarlığa qarşı heç də bir mənalı olmayan tendensiya yaranmışdı. Yerli inək cinsləri bəyənilmirdi. Rusiyadan, Pribaltikadan gətirilən cinslərə üstünlük verilirdi. Bu cinslər də yerli şəraitə çətin uyğunlaşırdılar. Xəstələnmə, xüsusən də qızdırma ölüm halları çoxalırdı. Məhsuldarlıq və balavermə aşağı düşürdü. Məcburi kəsim çoxalırdı. Qısırlıq həddən artıq idi.

Camışçılığa münasibət lap pis idi. Sanki yerli inək, camış cinslərinə qarşı səlib yürüşü aparılırdı. Fikir yaradılırdı ki, yerli cinslər, xüsusən də camış rentabelli deyil, məhsul istehsalı aşağıdır. Yeri gəldi-gəlmədi inəklərin yerinə camışlar kəsimə göndərilirdi. Camışa münasibət lap absurd vəziyyətə gəlib çıxmışdı.

Hətta, o vaxtlar başda ikinci katib Kozlov olmaqla bir qrup məmur tərəfindən Respublika Kommunist Partiyası MK-nın bürosuna camışçılığın ləğvi barədə qərar layihəsinin çıxarılması da planlaşdırılmışdı. Bu isə təkcə yanlış fikir, düşünülməmiş addım deyildi. Bu xalqımızın yüz illiklər boyu seçib yetişdirdiyi, zaman-zaman yeniləşdirdiyi, qoruyub saxladığı, var-dövlətdən, xəzinədən, ona sağlamlıq, şəfa verən, güc-qüvvət verən bardan-bəhərdən, bineyi-qədimdən yaradılmış heyvandarlıq, damazlıq-seleksiya ənənələrindən, heyvandarlıq mədəniyyətindən, bütövlükdə, xalqın özünün epoxal tarixinin bir parçasından məhrum etməyə doğru atılan addım idi. Bu milli genefonda, xalqımızın mənafeyinə, xalqımızın özünə, sağlamlığına, tarixinə yönəlmiş bir qəsd idi.

Ata-babalarımızın məşğul olduğu bir sahə, camışçılıq məhv edilmək təhlükəsi qarşısında idi.

Bu məqamda mütəxəssislərimiz, ziyalılarımız əsl vətəndaşlıq mövqeyi tutdular, iradə və qətiyyət göstərdilər.

Əyyub müəllim öz həmfikirləri, mərhum Arif Mustafayev, Ağaxan Ağabəyli, İmran Əbilov, Surxay Tağızadə, Sadıq Murtuzayev kimi Azərbaycan heyvandarlığında camışın, camışçılığın yerini, çəkisini yaxşı bilən mütəxəssislərlə birgə bu qərəzli ideyanın gerçəkləşməsinə qarşı çıxdılar.

Onlar həmin dövrdə respublikamıza rəhbərlik edən ümummilli liderimiz, mərhum prezident Heydər Əliyevə müraciət etdilər. Camışçılığın üstünlükləri haqda, insana, onun sağlamlığına camış məhsullarının misilsiz faydası barədə hərtərəfli məlumat verdilər.

Müraciətdən sonra mərhum prezident Heydər Əliyev qərar layihəsinin büroda müzakirəyə çıxarılmasına belə yol vermədi. Ümumiyyətlə, bu məsələ

birdəfəlik bağlandı. Haqq-ədalət öz yerini tapdı. Xalqımıza yönəlmiş böyük bir qəsdin qarşısı alındı.

Təcrübə ilə nəzəriyyənin vəhdəti Əyyub müəllimin elmi yaradıcılığından qırmızı xəttlə keçir.

Alimin elə bir elmi müddəası, elə bir araşdırması yoxdur ki, təcrübədə öz təsdiqinin tapmasın. Heyvandarlığın, xüsusən də camışçılığın inkişafında, damazlıq heyvanların yetişdirilməsində, yeni cinslərin yaradılmasında, kənd təsərrüfatı heyvanlarının çoxaldılmasında, sağlamlaşdırılmasında süni mayalanmanın böyük əhəmiyyətini əyani, təcrübədə göstərmək, dünyada ilk dəfə camışların süni mayalandırılmasının həyata keçirilməsinin metod və texnologiyalarının hazırlanması, tətbiqı və ən əsası nəzəriyyə ilə təcrübənin vəhdəti Əyyub Bəşirov yaradıcılığının ən üstün, ən əhəmiyyətli cəhətlərindəndir.

Başqa bir cəhət də bundan ibarətdir ki, rus və Azərbaycan aqrar elmi məktəblərinin ən qədim, ən zəngin, ən qabaqcıl ənənələri alimimizin yaradıcılığında öz dərin əksini tapır. Həm də bu iki böyük məktəbin təsiri, əhatə dairəsi o qədər geniş, o qədər güclüdür ki, həmin irslə tanışlığın ilk anındaca yəqinlik hiss edirsən, inanırsan ki, bu iki məktəb Əyyub Bəşirov yaradıcılığının nəhəng kökləri, qaynaqlarıdır.

Əyyub Bəşirovun elmi yaradıcılığının ilkin, həm də olduqca möhkəm təməlləri, bünövrəsi qeyd etdiyimiz kimi, Moskvada təhsil aldığı dövrdə, ötən əsrin əllinci illərin əvvəllərində qoyuldu. 1951-1953-cü illərdə alimin yazmış olduğu referatlar, elmi hesabatlar, məruzələr Moskva elmi mühiti, Moskva elmi ictimaiyyəti tərəfindən təqdir olunur, rəğbətlə qarşılanırdı.

Məhz həmin elmi əlyazmalar, referatlar, məruzələr, hesabatlar alimin yaradıcılığının dayaqları, dirəkləri idi. Bu dayaqların daha da möhkəmlənməsi üçün Moskva elmi mühiti münbit şərait, münbit zəmin yaradırdı.

O illərdə Moskva dünya aqrar elminin ən nəhəng, ən tanınmış mərkəzlərindən idi. Burada aqrar elmin müxtəlif problemləri ilə məşğul olan, nüfuzlu elmi təşkilatlar, elmi müəssisələr, elmi-tədqiqat institutları fəaliyyət göstərirdi. Lenin adına Ümumittifaq Kənd Təsərrüfatı Elmlər Akademiyası (indi Rusiya Kənd Təsərrüfatı Elmləri Akademiyası), akademik K.A.Timiryazyev adına Moskva Kənd Təsərrüfatı Akademiyası, Baytarlıq Akademiyası, Atçılıq İnstitutu, Ümumittifaq Elmi-Tədqiqat Heyvandarlıq İnstitutu və s. dövrün ən qabaqcıl elm ocaqları, elmi idarələrindən idilər. Təkcə elə Ümumittifaq Kənd Təsərrüfatı nailiyyətləri sərgisinin özü böyük bir akademiya idi.

O dövrdə Viktor Konstantinoviç Milovanov, Firuz Əli oğlu Məlikov, İrina İvanovna Sokolovskaya kimi nəhəng alimlər aqrar elminin problemlərinin həllinin ağırlığını öz çiyinlərinə götürmüşdülər. Məhz belə alimlərin adları ilə bağlı elmi məktəblər formalaşmış, yaranmışdı. Bunların da arasında ən qabaqcılları, akademiklər V.K.Milovanov və F.Ə.Məlikov elmi məktəbləri idi. Bu məktəblər aqrar elmin bir çox aktual problemlərini həll etməklə onun inkişafına böyük təkan vermişdilər. Bu elmi məktəblər keçmiş İttifaqda həll etdikləri elmi problemlərin əhəmiyyətinə, özlərinin nüfuzu və əhatə dairələrinə görə fərqlənirdilər.

1947-ci ildə biologiya elmində böyük əhəmiyyətə malik elmi kəşf edildi. Akademik V.K.Milovanovun elmi rəhbərliyi ilə professor İ.İ.Sokolovskaya və İqor Smirnov dovşan, buğa, qoç toxumlarının dondurulması və uzun müddət ərzində saxlanılması metodunu hazırladılar. Yeri gəlmişkən, deyək ki, təqribən on il sonra, 1956-1957-ci illərdə də camış (kəl) toxumunun dondurulub uzun illər saxlanılması metodunu isə akademik Əyyub Bəşirov hazırladı. Belə bir metodun işlənib hazırlanması toxumun uzun illər ərzində saxlanılmasına, heyvanların daha sağlam, daha məhsuldar neslinin alınmasına səbəb oldu.

Mühüm əhəmiyyətə malik belə tədqiqatlar Azərbaycanda da aparılırdı. Azərbaycan aqrar elmi məktəbi heç də Rusiya, Moskva elmi məktəblərindən geri qalmırdı.

Azərbaycanda da elmin digər sahələri ilə yanaşı aqrar, kənd təsərrüfatı, biologiya elmlərinin də inkişafına xüsusi diqqət yetirilirdi. Respublikada çox güclü aqrar elmi məktəbi fəaliyyət göstərirdi. Yuxarıda qeyd etdiyimiz kimi, bu məktəbə akademik Firuz Məlikov rəhbərlik edirdi.

Akademik Firuz Məlikov da akademik Viktor Milovanov kimi, dünyanın ən nüfuzlu elm ocaqlarından birinin, Lenin adına ÜKTEA-nın həqiqi üzvü idi. Akademik Firuz Məlikov tək Azərbaycan aqrar elmi məktəbinin deyil, bütövlükdə Qafqaz bölgəsi üzrə elmi məktəbinin yaradıcısı idi. O, Qafqaz üzrə heyvandarlıq sahəsində aparılan bütün elmi-tədqiqat işlərinə rəhbərlik edirdi. Elə buna görə də Qafqaz aqrar elmi məktəbinin yaranması, fəaliyyət göstərməsi akademik Firuz Məlikovun adıyla bağlı idi. Akademik Əyyub Bəşirov da zəmanələrinin böyük alimlərindən, V.K.Milovanovdan və Firuz Məlikovdan dərs almışdı.

Bir alim kimi Əyyub Bəşirovun formalaşmasında, yaradıcılığının inkişafında bu iki məktəbin müstəsna əhəmiyyəti, böyük rolu olub. Alimin yaradıcılığı kökən bu məktəblərə bağlıdır. Lap dəqiq desək, Əyyub Bəşirov bir alim kimi bu iki məktəbin yetirməsidir.

Daha iki mühüm mənbə, qaynaq üzərində də dayanmaq vacibdir. Bunlardan biri dünya təcrübəsi, dünya aqrar elmi fikri, digəri isə xalqımızın kənd təsərrüfatı heyvanlarının bəslənilməsi, yetişdirilməsi, yeni cinslərin yaradılması ilə bağlı ta qədim zamanlardan bəri formalaşmış, təşəkkül tapmış, oturuşmuş, dərin köklərə söykənmiş, mayası halallıqdan yoğrulmuş ənənələrdir.

Əyyub Bəşirovun bir alim kimi, şəxsiyyət kimi formalaşması digər amillərlə, daha dərin köklərlə bağlıdır. Üstündə dünyaya göz açdığı torpaq, el-oba, mənsub olduğu nəsil, tərbiyəsini aldığı, halal çörəyi ilə böyüdüyü ailə, təhsil aldığı məktəb, elm ocaqları, əhatəsinə düşdüyü elmi və ictimai mühit.

Bütün bunların hamısı dərinə işləyən, dərinə gedən köklərdir. Bu köklərə bağlılıq ucalıq, əzəmət, möhkəmlik, sarsılmazlıq, el-oba üçün bərəkət, bəhər gətirər.

Əyyub Bəşirovun elmi yaradıcılığı ötən əsrin ortalarından bu günə kimi istər ölkə, istərsə də beynəlxalq elmi ictimaiyyət tərəfindən daim izlənilib və bu gün də izlənməkdədir.

Azərbaycan, Rusiya, keçmiş İttifaqın digər respublikalarının, ayrı-ayrı xarici ölkələrin tanınmış alimləri, mütəxəssisləri hələ o dövrdə Əyyub Bəşirovla müntəzəm olaraq fikir mübadilələri aparır, onun işləyib hazırladığı süni mayala-

manın qabaqcıl metod və texnologiyalarıyla, apardığı müxtəlif təcrübələrlə tanış olurdular.

Bu elmi araşdırmaları, elmi təcrübələri, əldə edilmiş nəticələri yüksək qiymətləndirərək öyrənir, bunların öz ölkələrində də geniş tətbiq edilməsinə çalışırdılar.

1959-cu ilin dekabrında Azərbaycan Respublikası Elmlər Akademiyasının Prezidenti, akademik Yusif Məmmədəliyev və Azərbaycan Kənd Təsərrüfatı Elmlər Akademiyasının Prezidenti, akademik Firuz Məlikov Əyyub Bəşirovun laboratoriyasına gəlmiş alimin dondurulmuş kəl toxumunun tədqiqi (metod və texnologiyası) ilə tanış olmuş, alınan nəticələri isə möcüzə adlandırmışlar.

1959-cu ildə VASXNIL Rusiya Kənd Təsərrüfatı Elmlər Akademiyasının akademik katibi N.F.Rostovtsev, 1960-cı ildə akademik V.K.Milovanov və professor İ.İ.Sokolovskaya, 1961-ci ildə akademik K.A.Timiryazyev adına Moskva Kənd Təsərrüfatı Akademiyasının kafedra müdiri, professor V.K.Spilov Moskvanın müxtəlif elmi-tədqiqat institutlarının, tədris ocaqlarının alimləri ilə birlikdə Əyyub Bəşirovun hazırladığı yeni orijinal metod və texnologiyalar, apardığı təcrübələri öyrənib Moskva vilayətinin təsərrüfatlarında geniş tətbiq edərək yüksək nəticələr əldə etmişlər.

Vaxtilə İ.V.Stalin və N.S.Xruşşovun müşaviri olmuş, ÜİHİ-nun keçmiş direktoru, P.Lumumba adına Universitetinin təşkilatçılarından biri, həmin universitetin kənd təsərrüfatı fakültəsinin dekanı, professor İvan Matveyeviç Kuznetsov həyat yoldaşı, elmlər namizədi Vera Mixaylovna ilə birlikdə 1962-ci ildə bir ay ərzində Azərbaycan ETHİ-nunda Əyyub Bəşirovun elmi tədqiqatları ilə dərindən tanış olmuşlur. Əyyub müəllimin digər alimlərimizlə birgə yaratdığı ağ camış naxırı, dondurulmuş toxumdan alınmış rekord camışlar və zebu hibridləri, onun hazırladığı yeni metod və texnologiyaları öyrənmiş, əldə edilmiş nəticələri yüksək qiymətləndirmiş və bunların geniş miqyasda yayılıb geniş tətbiq olunması həmin elmi nəticələr barədə sənədli film çəkilməsini məsləhət bilmişlər.

Məhz bu ideya, bu fikir əsasında da məşhur sovet rejissoru Aleksey Plotnikov 1962-ci ildə "Cavan alimin müvəffəqiyyətləri" adlı qısametrajlı sənədli film çəkdi. Həmin film o vaxtlar keçirilmiş Beynəlxalq kinofestivalda birinci yeri tutaraq qızıl medala layiq görülmüşdür.

Əyyub Bəşirovun elmi yaradıcılığının əsasını təşkil edən istiqamətlərdən biri də kənd təsərrüfatı heyvanlarının yeni məhsuldar cinslərinin hər cins üzrə damazlıq təsərrüfatlarının yaradılması, naxırların, sürülərin cins tərkiblərinin yaxşılaşdırılması, ölkəmizin təbii şəraitinə uyğun hibridlərin alınması və ölkəmizin müxtəlif bölgələrinə yayılmasının təmin olunmasıdır.

Dediklərimizin ən bariz nümunəsi kimi Azərbaycanın subtropik zonasında, Lerikdə, 1976-1978-ci ildə, "Sosialist Kubası" sovxozunda Kubadan yarımvəhşi zebuların gətirilib yerli şəraitə uyğunlaşdırılması və yerli zebu və digər qaramal cinsləri ilə çarpazlaşdıraraq hibridlərin alınması, Kuba zebusunun respublikanın on altı dağ rayonlarına yayılmasını misal gətirmək olar. Bunun da əsasında yerlərdə hibridləşmə gedib. Bu hibridlərin keyfiyyəti barədə təkcə bir faktı

qeyd etmək istərdik ki, onların erkəklərinin diri çəkisi 1500 kq-a çatırdı. Bu barədə biz aşağıda daha ətraflı bəhs edəcəyik.

Keçmiş Sovet məkanında yeganə damazlıq zavodu kimi tanınan, özünəməxsus tarixə, təsərrüfat və elmi-təcrübəvi baxımdan zəngin ənənələrə malik Daşüz camışçılıq təsərrüfatı Əyyub Bəşirovun yaradıcılığı ilə sıx bağlıdır. Fikrimizi başqa sözlərlə ifadə edib, -- Daşüz damazlıq zavodu alimin yaradıcılığının xalqımıza bir töhfəsidir, -- desək yanılmarıq. Əyyub Bəşirov dünyada ilk dəfə elmə gətirdiyi süni mayalamanın yeni metod və texnologiyalarının ilkin köklü sınaqları (ilk təcrübələri) da burada aparılmışdır. Yeni yaradılmış və 1970-ci ildə təsdiq edilmiş Azərbaycan camış cinsinin tamazlıq nüvəsi də bu zavodda yetişdirilmişdir.

Bu istiqamətdə aparılan elmi tədqiqatlar, əldə olunan elmi nəticələr xalqımızın çox qiymətli, əvəzsiz milli sərvəti olan unikal genefondların, cinslərin qorunub saxlanılmasında, yenilərinin yaradılmasında mühüm əhəmiyyət kəsb etmişdir.

Bu sahədə görülən işlərin kökü ötən əsrin altmışıncı illərinə gedir. 1961-ci ildə Hindistanda, Heydərabad şəhərində alimimizin təklifi ilə Ümumhindistan heyvandarlıq sərgisi" təşkil edilir. Bu sərgidə Əyyub Bəşirov Hindistanın 12 camış, 38 zebu cinslərinin genefondunu öyrənir. Bombey südçülük koloniyasından isə "Mürrəh" cinsindən olan damazlıq rekord camış kəllələri və düyələri seçir. Bunlar, Azərbaycana gətirilsə bu rekord heyvanlar da, o zaman son anda Moskvanın göstərişi ilə Bolqarıstana göndərilir. Həmin heyvanların əsasında da Əyyub Bəşirov bolqar alimi, professor Aleko Aliksiyevlə birgə "Bolqar mürrəhi" cinsini yaradır. Öz yüksək məhsuldarlığı, yüksək keyfiyyəti ilə "Bolqar mürrəhi" bu gün də dünyada seçilir.

Əyyub Bəşirov görkəmli alimlərimiz, professorlar Ağaxan Ağabəyli, Abdulla Həşimov və Surxay Quliyev, İnqilab Hüseynovla birgə dünyada ilk ağ camış sürüsünü yaratmışdır.

2007-ci il iyunun 29-da Respublika Kənd Təsərrüfatı Nazirliyinin Damazlıq Şurası tərəfindən iki yeni qoyun cinsi təsdiq edildi. Bunlardan biri Morul Dəmirovun seleksiyası əsasında yaradılmış "Mil-Qarabağ", digəri isə Nəcəf Nəcəfovun "Abşeron" cinsləridir. Hər iki cinslərin yaradılmasının rəhbəri Əyyub Bəşirov olmuşdur.

Azərbaycan kənd təsərrüfatı sistemində özünü bacarıqlı elm və təsərrüfat təşkilatçısı kimi göstərən alimin respublikada uzun müddət rəhbərlik etdiyi damazlıq-seleksiya sisteminin, süni mayalama laboratoriyalarının, stansiyalarının, mərkəzlərinin yaradılmasında, səmərəli fəaliyyət göstərmələrində müstəsna rolu olub. İstər elmi, istərsə də həmin sistem üçün savadlı, səriştəli praktik kadrların yetişdirilməsi Əyyub Bəşirovun fəaliyyətinin ən mühüm istiqamtlərindəndir.

1948-ci ildə hələ tələbə ikən istehsalat təcrübəsi zamanı, Ağdam rayonundakı Qarabağ Atçılıq zavodunun təşkili zamanı Qarabağ atlarının seçilməsi, qiymətləndirilməsi (bonitrə edilməsi), 1951-ci ildə Xıllı rayonunun Xolqarabucaq kəndindəki Stalin adına kolxozda, 1954-cü ildə Saatlı rayonunun Sarıcalar kəndindəki "Kür-Araz" təcrübə stansiyasında, 1956-cı ildə Azərbaycan Elmi-Tədqiqat Heyvandarlıq İnstitutunda, 1957-ci ildə Daşüz camışçılıq üzrə damaz-

lıq zavodunda, 1971-1972-ci illərdə isə Neftçala rayonunun M.B.Qasımov adına camışçılıq sovxozunda süni mayalama laboratoriyası və mərkəzlərinin ilk dəfə olaraq təşkili onun yüksək təsərrüfatçılıq bacarığından, imkanlarından xəbər verirdi.

1954-1987-ci illəri əhatə edən bir zaman ərzində Azərbaycanda 1 respublika, 2 vilayət, 56 rayonlararası və rayon dövlət döllük-damazlıq stansiyaları, ayrı-ayrı təsərrüfatlarda 1500-ə yaxın süni mayalama məntəqələri təşkil edildi.

1968-1989-cu illərdə Pirşağı qəsəbəsində 1971-ci ildən fəaliyyət göstərən Respublika Süni Mayalama Stansiyasının nəzdində Respublika Elmi Biotexnoloji Mərkəzi yaradıldı.

Embrion köçürmə və İmmunogenetika laboratoriyaları da bu quruma daxil edildi.

Respublikada heyvandarlığın elmi əsaslarla inkişafının yüksəldilməsi, həmin əsasların möhkəmləndirilməsi, damazlıq sisteminin, süni mayalama stansiyalarının fəaliyyətinin səmərəliliyinin artırılması məqsədilə Əyyub müəllim bir sıra islahatlar aparır. 1971-ci ildə təşkil etdiyi Pirşağıda yerləşən Dövlət Damazlıq və Süni Mayalama Stansiyasını genişləndirir. Mərdəkandakı Abşeron Dövlət Damazlıq və Süni Mayalama Stansiyasını birləşdirir. Sabirabaddakı Elmi Tədqiqat Heyvandarlıq Stansiyası isə Mərdəkana köçürülür. Həmin bu stansiya 1971-ci ildən bu günə qədər Abşeron Elmi Tədqiqat Heyvandarlıq Təcrübə Stansiyası kimi fəaliyyət göstərir.

Əyyub müəllim 1989-93-cü illərdə Abşeron Dövlət Damazlıq və Süni Mayalama Stansiyasının nəzdində Moskva Mərkəzi Elmi Tədqiqat Yemlərin Texnologiyası və Kənd Təsərrüfatı Heyvanlarının Yemləndirilməsi İnstitutunun Azərbaycan filialını təşkil etdi və onun rəhbəri oldu. Bu gün də həmin filiala ictimai əsaslarla rəhbərliyi davam etdirir.

Əyyub müəllim müxtəlif dövrlərdə Hindistanda, Əlcəzairdə, Çilidə və Əfqanıstanda olarkən bu ölkələrin kənd təsərrüfatı sahəsinin, damazlıq-döllük sisteminin təşkilində, inkişaf etdirilməsində və möhkəmləndirilməsində, milli kadrların hazırlanmasında əvəzsiz xidmətlər göstərmişdir. Elə buna görə də həmin dövlətlərin dövlət başçıları alimimizin şəxsən özünə və Sovet dövlətinin lideri Leonid Brejnevə dərin minnətdarlıqlarını bildirirdilər.

İstər Çilinin o vaxtkı prezidenti Salvador Alyendenin, istərsə də Əlcəzair prezidenti Huarı Bumedyanın minnətdarlıq məktublarının arxasında isə Azərbaycan aliminin gərgin əməyi, bu ölkələrin kənd təsərrüfatı sistemini dirçəldilməsinə, möhkəmləndirilməsinə yönəlmiş elmi tədqiqatları, yazdığı elmi əsərləri, həyata keçirdiyi əməli tədbirləri dayanırdı.

Məlumdur ki, Çilidə heyvandarlıq sahəsinin inkişafına böyük önəm verilir. Çünki ölkə əhalisinin heyvandarlıq, xüsusən də ətə, ət məhsullarına tələbatı olduqca böyükdür. Milli Birlik hökuməti dövründə, ötən əsrin 70-ci illərinin əvvəllərində Sovet hökuməti tərəfindən bir ekspert-alim, mütəxəssis kimi Çiliyə ezam olunan Əyyub Bəşirov bu ölkənin iqlim şəraitinin otlaqların, çöl-çəmən, meşə, ot örtüklərini, su mənbələrini, yağan yağıntının miqdarını, heyvandarlığın ayrı-ayrı bölgələr inkişaf perspektivlərini, heyvandarlığın maddi-texniki bazası-

nı, sahənin inkişafına lazım gələn bütün amilləri araşdırıb öyrənir, tədqiq edir. Aparılan tədqiqatların nəticəsi kimi "Çilinin heyvandarlığı" adlı fundamental əsər ortaya qoyulur. Əsərdə ölkə heyvandarlığının vəziyyəti, sahə ilə bağlı bütün amillər qarşıya çıxan bütün problemlərin dərin analizi verilir və bu problemlərin həlli yolları araşdırılır, tapılıb göstərilir. Bütün bunlar da aparılan müşahidələrə, hesablamalara, əldə edilən dəqiq faktlara, rəqəmlərə, onların da əsasında tərtib olunmuş cədvəllərə söykənir. Bütün faktların, rəqəmlərin, cədvəllərin köməyi ilə o dövrdə Çilinin heyvandarlığının aydın ümumi mənzərə yaradılır. Geniş təhlili verilir.

Elmi əsaslara söykənən problemlərin həlli yolları göstərilir.

Bu əsər ötən yüz illikdə Çilinin heyvandarlığına həsr olunmuş ən sanballı əsərlərdən, elmi-tədqiqat işlərdən biri, dünya aqrar elmi tarixinə layiqli bir töhfədir.

Bundan savayı, Əyyub Bəşirov o dövrdə Çilidə dövlət damazlıq sisteminin, damazlıq seleksiya işlərinin, damazlıq, süni mayalama stansiyalarının, məntəqələrinin təşkilinə və yenidən qurulmasına, fəaliyyətlərinin yönəldilməsinə yaxından köməklik göstərmiş, elmi-nəzəri məsələlərin reallaşdırılmasında, alınmış elmi nəticələrin təcrübədə gerçəkləşdirilməsində fəal iştirak etmişdir.

Əyyub Bəşirov Çilidə elmi ezamiyyətdə olarkən bu ölkədə damazlıq heyvandarlığın inkişafı və proqressiv metod və texnologiyalarının tətbiqi, kadr hazırlığı kimi bir çox elmi problemlərin həllini nəzərdə tutan 10 illik plan-proqram işləyib hazırlamışdır.

Bu plan-proqram dərin elmi əsaslara söykənirdi. Həmin proqramın yerinə yetirilməsi isə Çilinin heyvandarlığının inkişafının təkanverici qüvvəsi, təminatı demək idi.

Prezident Salvador Alyendenin aşağıdakı sözləri isə azərbaycanlı alimin əməyinə verilən yüksək qiymətdir.

-- "Mister Əyyub Bəşirovun 45 gündə gördüyü iş Çilinin birinci dərəcəli elmi-tədqiqat institutlarının 6 ayda gördüyü işlərə bərabərdir".

Bu sözlər, həm də, bütövlükdə, dünya aqrar elmin inkişafı naminə göstərilən xidmətin qarşılığıdır.

Əyyub müəllimin 1964-1966 və 1968-1970-ci illərdə Əlcəzairdə gördüyü işlər, apardığı elmi tədqiqatlar bu ölkənin kənd təsərrüfatının, heyvandarlığının inkişafında mühüm rol oynadı. Ölkədə damazlıq heyvandarlıq yaradıldı. Süni mayalama stansiyaları təşkil edildi. Süni mayalamanın geniş tətbiqi vasitəsi ilə məhsuldarlıq artırıldı. Müasir texnologiyalardan istifadə olunması, süni mayalamanın aparılması qısırlığı aradan qaldırdı. Həyata keçirilən tədbirlər hər 100 ana qoyundan 111, inəklərdən isə 100-102 bala almağa imkan verdi. O dövrdə bu rəqəmlər qoyunlar üzrə Şimali Afrika ölkələrində görünməmiş rekord bir göstərici idi. İnəklərdən alınan balaların sayı isə dünya rekordu idi. Həm də həmin bölgədə, həmin ölkələr arasında ilk dəfə olaraq Əlcəzairdə damazlıq-seleksiya, damazlıq-döllük, süni mayalama stansiyalarında, məntəqələrində çalışacaq mütəxəssislər korpusu yaradıldı.

1966-cı ilin yayında Fransanın Kənd Təsərrüfatı naziri, baytarlıq xidməti generalının Əlcəzairə gəlməsi, Əyyub Bəşirovla görüşməsi, onun bu ölkədə

apardığı təcrübələr və əldə etdiyi elmi-təcrübəvi nailiyyətlərlə tanışlığı və ondan aldığı məsləhətlər alması nəticəsində, sonralar Fransada yeni bir texnologiya, - fransız süni mayalama texnologiyası yaradıldı.

Hazırda ən mütərəqqi, ən proqressiv texnologiya kimi bundan dünyanın bütün qabaqcıl ölkələrində geniş istifadə edilir.

Ötən əsrin səksəninci illərində Əfqanıstanda gedən mürəkkəb tarixi proseslərin ən qızğın çağında Əyyub Beşirov bu ölkədə işləməli olur. Kənd təsərrüfatı nazirinin müşaviri vəzifəsində çalışan alim bu ölkənin aqrar sektorunun dirçəldilməsinə, inkişaf etdirilməsinə, məhsul istehsalının artırılmasına, sahənin elmi əsaslarının yaradılmasına yönəlmiş tədbirlərin həyata keçirilməsinə nail oldu.

Həmin dövrdə Əfqanıstanda bir-birinə qənim kəsilən hər iki tərəf -- Şurəvilər və "düşmənlər" Əyyub müəllimin qarşısında əyilirdilər. Silah qarşısında əyilməyənləri onun nüfuzu əyirdi. "Düşmənlər" deyirdilər ki, sən bizə, bizim ölkəyə müharibənin odunu, alovunu yarıb həyat gətirirsən, viran qalmış torpaqlarımızı dirildirsən.

Kuba zebusunun Azərbaycanın subtropik zonasında yerli şəraitə uyğunlaşdırılması, hibridləşdirilməsi, yeni nəslin alınması iki ölkə arasındakı birgə əməkdaşlığın, qarşılıqlı əlaqələrin qurulmasının bariz nümunəsidir. Söhbətimizin əvvəlində bu barədə danışmışdıq. İstərdik ki, heyvandarlıq tariximizin inkişafında mühüm hadisə, böyük əhəmiyyətə malik heyvandarlıq təcrübəsindən geniş bəhs edək.

Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin apardığı məqsədyönlü siyasət sayəsində müstəqil dövlətimizin dünya ölkələri ilə iqtisadi, siyasi əlaqələri yeni, daha geniş mərhələyə daxil olub. Bu baxımdan Kuba Respublikası ilə, xüsusən də aqrar sahədəki əlaqələr böyük maraq doğurur.

Bu əlaqələrin bünövrəsi hələ ötən əsrin yetmişinci illərində, ümummilli liderimiz, mərhum prezident Heydər Əliyevin respublikaya rəhbərlik etdiyi dövrdə qoyulub. 1976-cı ildə Kubadan ölkəmizə 121 baş yarımvəhşi zebu gətirildi. Bu heyvanlar Lerikdə yerli şəraitə uyğunlaşdırılmalı, yerli iribuynuzlu heyvanlarla hibridləşdirilməli və respublikanın rayonlarına yayılmalı idi. Bu çətin, məsuliyyətli işin elmi rəhbərliyi Əyyub Bəşirova tapşırılır. Təkcə iki ölkə arasındakı iqlim fərqini nəzərə alsaq, bu işin nə qədər problemli olduğu aydın görünər. Belə ki, oktyabr ayından aprel ayı bitənədək Lerikdə havanın temperaturu --13-ə qədər enir. Bu dövrdə isə Kubada havalar çox isti keçir.

Çoxsaylı belə problemlərə baxmayaraq heyvanların gətirilməsindən 15 ay sonra 108 zebudan 78 bala alındı. Zebu buğalarının çəkisi 1000-1500 kq-a çatdırıldı. Hər zebudan gündə, yağlılığı 5 faiz olmaqla, 10 kq süd sağılırdı.

Geniş miqyaslı hibridləşmə aparılması məqsədilə Kuba zebularının buğaları respublikanın 16 dağlıq rayonuna yayıldı. Aparılan tədqiqatlar bir daha sübut etdi ki, respublikada ət və süd məhsulları istehsalının sürətlə artırılmasında zebu cinsi ilə hibridləşmənin aparılması böyük əhəmiyyətə malikdir. Bu hibridləşmə istehsalın artırılmasında böyük təkanverici rol oynayır.

1978-ci ilin aprelin 26-30 ərzində Lerikdə aparılan işlərlə tanışlıq məqsədilə ora gələn Kuba diplomatı, o dövrdə, Kubanın SSRİ-dəki səfiri işləmiş Kor-

sedo gördüklərinə inanmır. Məəttəl qalır, deyir ki, axı, necə ola bilər ki, bütün günü Kubada çöllərdə gəzən bu yarımvəhşi zebular, tövlə-otlaq şəraitində bəslənilir, insanla mehriban davranır, qaçmır, sağılır, qaşovlanır, yemlənir, süni mayalandırılır və s.

Göründüyü kimi, Azərbaycanın yüksək dağlıq, subtropik iqlim şəraitində, Lerikdə Kubadan gətirilmiş zebularla yerli cinsin cütləşdirilib hibrid alınması da hörmətli alimimizin adı ilə bağlıdır.

Bütün bunlar Əyyub Bəşirov yaradıcılığının, bütövlükdə, Azərbaycan aqrar elminin dünya aqrar elminə verdiyi töhfələrdir. Dünya aqrar elminin inkişafına xidmət edən elmi qənaətlərin, elmi araşdırmaların, tədqiqatların uğurlu nəticələri, onu möhkəmləndirən elmi zəminlər, elmi əsaslardır. İstər Azərbaycanın, istərsə də hər hansı xarici ölkənin kənd təsərrüfatı ilə bağlı olsun, Əyyub Bəşirovun apardığı elmi-tədqiqat işlərinin məqsədi, yönümü birdir -- insanların sağlamlığı, rifahı, firavanlığı, məhsul bolluğunun yaradılması, iqtisadiyyatın, aqrar sahənin inkişafının gücləndirilməsi, ekologiyanın təmizliyi. Alimin elmi irsinin mahiyyəti, əhəmiyyəti bundadır.

Təbii ki, Əyyub Bəşirovun elmi yaradıcılığı bütövlükdə Azərbaycanla, onun kənd təsərrüfatı, heyvandarlığı ilə bağlıdır. Bu yaradıcılıq Azərbaycan aqrar elminin mühüm tərkib hissəsidir.

Azərbaycan heyvandarlıq elminin elə bir sahəsi yoxdur ki, bu, alimin apardığı tədqiqatların obyekti olmasın. Camışdan başqa, maldarlıq, dəvəçilik, atçılıq, qoyunçuluq, quşçuluq, arıçılıq, balıqçılıq, ipəkçilik kimi sahələrin inkişaf perspektivləri Əyyub Bəşirov tərəfindən müntəzəm tədqiq edilib öyrənilib. Hətta bu sahələrin kompleks, əlaqəli inkişafı problemi də araşdırılıb. Məsələn, Abşeronda maldarlığın, camışçılığın, balıqçılığın, quşçuluğun, arıçılığın kompleksli, əlaqəli inkişafına nail olmağın yollarını aydın göstərən elmi-tədqiqat işi, dövlət əhəmiyyətli layihəsi bu baxımdan böyük əhəmiyyət daşıyır. Bu əsərdə iqlim şəraitinin heyvandarlıqdakı rolu, yem bazasının möhkəmləndirilməsi, qiymətli yem kimi yoncanın arpa, dən senajının rasiondakı yeri, balıqçılıqda camış peyinin istifadəsi, yem kimi əhəmiyyəti, su mənbələrinin, nohurların, göllərin, bataqlıqların, onların bitki örtüyünün camışçılıqdakı əhəmiyyəti və yeri geniş, əhatəli, həm də bir-biri ilə əlaqəli şəkildə öyrənilir.

Əyyub Bəşirovun elmi yaradıcılığında heyvandarlığın ümumi inkişafı, bunun elmi əsasları, onunla birbaşa bağlı olan amillər və faktorlarla, yerli iqlim şəraiti, çöl-çəmən bitkilərinin və bunların ilin hansı fəsillərindən asılı olaraq necə inkişaf etmələri, yem bazasının yaradılması, heyvanların səmərəli yemləndirilməsi üsulları, arpa, dən, qarğıdalı, yonca qarışıq senajın hazırlanması, otlaqların, yem bazasının vəziyyəti və digər vacib şərtlərlə sıx əlaqədə, eləcə də bunların bir-birinə qarşılıqlı təsiri ilə vəhdətdə götürülür, tədqiq edilir.

"Muğan bölgəsində yay düşərgə şəraitində yeniləndirilib saxlanılmasının camışlara təsiri", "Azərbaycan şəraitində kənd təsərrüfatı heyvanlarının balaverməə, balaların yaşama qabiliyyətinin yüksəldilməsi yolları", "Azərbaycanın ekstremal iqlim şəraitində camışların sağlamlığına, tənacül fəaliyyətinə cinsi və məhsuldarlıq keyfiyyətinə təsir edən amillər", "Azərbaycanın dağlıq şəraitində,

yaylaqda qoyunların süni mayalandırılmasının metod və texnologiyalarının sistemləşdirilməsi" və s. kimi əsərlərdə dediyimiz məsələlər tədqiq edilir.

Heyvandarlıqda süni mayalamanın əhəmiyyəti, rolu böyükdür. Heyvanların cins tərkibinin yaxşılaşdırılmasında, yeni nəslin alınmasında, sürünün, naxırın sağlamlaşdırılmasında, məhsuldarlığın yüksəldilməsində və s.-də süni mayalama əvəzsizdir. Süni mayalamanın elmə gətirilməsi, elmi tarixi də qədimdir. Lazaro Spalansani, İlya İvanov, akademik V.K.Milovanov, professorlar İ.İ.Sokolovskaya, Ağaxan Ağabəyli, akademik Əyyub Bəşirov kimi bir çox alimlər süni mayalama sahəsində tədqiqatlar, araşdırmalar aparmışlar.

Azərbaycanda hələ ötən əsrin 30-cu illərində professor Ağaxan Ağabəyli və Müseyib Mədətov bu sahədə ilk sınaqlar, təcrübələr aparmışlar.

Lakin dünya aqrar elm tarixində ilk dəfə olaraq kənd təsərrüfatı heyvanlarının, ilk növbədə camışların, süni mayalandırılmasının mütərəqqi, orijinal metod və texnologiyaların işləyib hazırlayan, bunları sistemləşdirən və heyvandarlıq təcrübəsində uğurla həyata keçirən akademik Əyyub Bəşirov olmuşdur.

Törədicilərin çoxalma üzvünün cərrahi yolla 30-45 bucaq altında öz təbii yerindən yana dəyişdirilərək toxum alınmasına hazırlanması və süni mayalamada istifadə edilməsinin, camışların süni mayalanmasının, alınan toxumların durulducularla duruldulması, dondurularaq uzun müddət saxlanılması, dondurulmuş toxumların uzaq məsafəyə müxtəlif nəqliyyat vasitələri ilə nəql edilməsi, dağlıq şəraitində, yaylaqda heyvanların süni mayalandırılması, dağlıq şəraitində alınan toxumların uzun müddət saxlanılmasının metod və texnologiyalarını sistemli şəkildə öyrənən, təcrübədə tətbiq edən, sistemləşdirən və bu sistemin elmi əsaslarını yaradan, bunları ilk dəfə aqrar elmə gətirən alimimiz olmuşdur.

Bütün bunlara nail olmaq üçünsə gərək heyvanların təbii, fizioloji, bioloji, hətta, tədqiqat altında olan törədicilərin və mayalandırılan inəklərin fərdi xüsusiyyətlərin, onlara təsis edən qıcıqlandırıcıları, heyvanların şərti və şərtsiz reflekslərini, sinir sistemini, ümumiyyətlə, baş-beyin sisteminin fəaliyyətini dərindən biləsən. Eyni zamanda, dərin müşahidələr aparasan, lap heyvanın ifrazat, necə deyərlər, sidik ifrazatı qrafikindən tutmuş ayrı-ayrı bitki və otlarla qidalanma meyllərinə qədər müşahidə altına alasan.

Bu baxımdan Əyyub Bəşirovun 2009-cu ildə çap olunmuş "Azərbaycan camışının törəyib çoxalmasının fiziologiyası" (rus dilində) kitabında verilmiş, müəllifin ilkin yaradıcılığının məhsulu olan, 1951-53-cü illərdə yazılmış "Törədici kəllərin və camışların cinsi refleksləri və yemləndirilməsi üzrə təcrübələr", "Yemləmə şəraitinin heyvanların şərtsiz reflekslərinə təsiri əsərləri çox maraq doğurur. Adı çəkilən birinci əsərdə Muğan zonasının otlaqları, metereoloji şəraiti, bu şəraitin bitkilərə, heyvanlara təsiri öyrənilir. Dörd il ərzində aparılan müşahidələr nəticəsində metereoloji şəraitin bitkilərə təsiri haqda məlumat toplanılır. 1952-ci ildə bu təsirin müsbət effektini göstərən informasiyalar, rəqəmlər, cədvəllər göstərilir. Həmin ildə otlaqların yem kütləsinin təyini, ayrı-ayrı bitkilərin heyvanlar tərəfindən necə yeyilməsi, otlaqların keyfiyyəti tədqiq edilir. Otlağın yem kütləsinin xarakteristikası üçün ayrılıqda hər bitkiyə məxsus vegetasiya dövrü, 168 bitkinin botanikası, hündürlüyü, yaşıl kütləsinin çəkisi, quru qalığı

kimi və s. göstəriciləri müəyyən edilir. Pişpişi, sarıqıyıq, keyikotu, dişli yonca, şora çayır kimi yüzlərlə bitkilərin təsnifatı aparılır.

Heyvanların refleksləri, o cümlədən camışların çoxalmasının mövsümiliyi, analıq, ətənə yemə, həvəsə gəlmə və s. refleksləri müfəssəl öyrənilir.

Reflekslərdən söz düşmüşkən onu da qeyd etmək yerinə düşərdi ki, aqrar elm tarixində ilk dəfə olaraq Pavlov təlimini camışlar üzərində öyrənməklə Əyyub Bəşirov camışların sinir sisteminin özünəməxsusluğu, bu özünə məxsusluğun onların çoxalmasına təsiri və b. cəhətlərə aid çox maraqlı elmi nəticələr əldə etmişdir.

Əyyub Bəşirov elmi yaradıcılığının ana xəttini, özəyini camışçılıq təşkil edir. Bu da təsadüfi deyil. Yuxarıda alimin doğulub böyüdüyü bölgədə camışa, camışçılığa münasibətdən, bu sahə ilə bağlı yerli şəraitdən, camışçılığa verilən önəmdən, qiymətdən, camışın əhalinin həyatındakı yeri barədə danışdıq. Təbii ki, camışçılığın Əyyub Bəşirov yaradıcılığında əsas yer tutmasının səbəbi, kökü də elə buradan gəlir.

Alimin əsərlərində camış bütün aspektlərdən araşdırılır, el dilində desək, dərisindən tutmuş gerisinədək öyrənilir, tədqiq edilir. Camışın əhəmiyyəti, digər heyvanlardan üstünlüyü, məhsuldarlığının çoxluğu və s. xüsusiyyətləri dəlil-sübutlarla, faktlar və rəqəmlərlə göstərilir.

Aparılmış tədqiqatlar sübut etmişdir ki, camış orqanizmi radiasiyaya uğramır və zərərli bakteriyalara dözümlüdür. Öz ekologiyasında heç bir xəstəliyə tutulmur. Bu səbəbdən də digər kənd təsərrüfatı heyvanlarından fərqli olaraq camış əti, süd məhsulları ekoloji, bioloji baxımdan daha təmizdir, daha keyfiyyətlidir. Camışın saxlanılması iqtisadi baxımdan daha sərfəlidir. Az zəhmət tələb edir. Bir o qədər də yem ehtiyatı toplamaq lazım gəlmir. Camışa qamış, bir də bataqlıq bitkiləri, kol-kos bəs edir.

Südə gəldikdə isə yağlılıq baxımından camış südü inək südündən iki-üç dəfə üstündür. Camışın südü və qanı ağqanlılıq, azqanlılıq kimi bəlalardan qurtulmağa imkan verir. Daim camış südü, ağartısı, ət ilə qidalanan insanlar xərçəng və vərəm xəstəliyinə tutulmur.

Məhsuldarlıq baxımından da camış üstündür. Əgər sutka ərzində inəkdən 4-5 litr süd almaq mümkündürsə, camışda bu rəqəm 10 litrə çatır. Rekord camışlarda isə həmin rəqəm 20-30 litr təşkil edir. Camış südünün yağlılıq faizi isə 8-12 faizdir.

Əyyub Bəşirov öz tədqiqatrları, elmi araşdırmaları, elmi dəlilləriylə camışın əvəzolunmaz sərvət, varlıq olduğunu sübut edir. Vaxt, zaman da alimimizin qənaətinin doğru olduğunu bir daha təsdiq etdi.

İndi FAO kimi beynəlxalq təşkilatlar yüksək səviyyəli elmi dairələr camışçılığın dünyada inkişafına, camış məhsulları istehsalının artırılmasına böyük önəm verir.

Heyvandarlıq tarixi ilə məşğul olan tarixçilərimiz sübut edir ki, Azərbaycan camışın ilk əhliləşmə ocaqlarından biridir. Bunun da tarixi 5-7 min il bundan öncəyə təsadüf edir. Tarixçilər bir də onu qeyd edirlər ki, Avropaya camış elə Azərbaycandan aparılıb. Bu da ilk növbədə onun keyfiyyət göstəriciləri ilə bağlı olub. Bu keyfiyyəti bolqar alimi, professor Aleko Aliksiçyevin dediyi, – Azər-

baycan camışı 24 karatlı brilliyantdır, yüksək əyarlı qızıldır, -- sözləri də təsdiq edir.

Heç təsadüfi deyildi ki, keçmiş İttifaqda saxlanılan camışın 85 faizi Azərbaycanda idi. Qonşu respublikalarda saxlanılan qalan 15 faizi isə mənşəcə Azərbaycan camışına bağlıydı. Bu rəqəmlərin arxasında çoxəsrlik xalq heyvandarlıq ənənələri, böyük təcrübə və bu heyvana bərəkət mənbəyi kimi bəslənən sevgi, hörmət dayanırdı. Bir də bunlardan qaynaqlanan, Firuz Məlikov, Ağaxan Ağabəyli, Əyyub Bəşirov kimi onlarla elm xadimlərinin öz əsərləri ilə zənginləşdirdiyi aqrar elmi. Əyyub Bəşirov öz müəllimi professor Ağaxan Ağabəyli ilə birlikdə yaratdığı "Azərbaycan" camış cinsi həm Azərbaycan aqrar elminin, həm də Azərbaycan camışçılıq məktəbinin yetirdiyi ən nadir incilərdəndir.

Azərbaycan camışçılıq məktəbini yaradanlar, onu dünyada tanıdanlar isə professor Ağaxan Ağabəyli və akademik Əyyub Bəşirovdur.

Bu da bir həqiqət, məntiqi nəticə, həm də böyük bir fədakarlıqdır ki, Əyyub Bəşirov öz həyatını, elmi yaradıcılığını, özünün də dediyi kimi, "Azərbaycanın qara mirvarisi" olan camışa, Azərbaycan camışçılıq elminə, aqrar elminə həsr edib.

Alimin irsiylə, arxivindəki əlyazmalarla tanış olduqca, təbii olaraq ilk andaca bir sualı öz-özünə verməli olursan:

-- Bütün bunları yazmağa necə vaxt tapıb?! Axı, vaxt-zaman dediyimiz məhdud bir çərçivədir!

Rəflərdə, dolablarda, qalaq-qalaq əlyazmalar, sənədlər, materiallar var ki, heç qatları belə açılmayıb. Hamısı da aqrar elmimizin toxunulmamış, öyrənilməmiş, öz tədqiqini gözləyən səhifələridir!

Təbii ki, bir məqalədə, bir yazıda bütün bunlardan, bütövlükdə, alimimizin elmi yaradıcılığından, elmi irsindən ətraflı bəhs etmək mümkün deyil. Bu geniş elmi-tədqiqat işinin, araşdırmanın aparılması daxilindədir. Çox təəssüf ki, belə bir zəngin, elmi irs tədqiqatçıların diqqətindən kənardadır. Halbuki, bu irs təkcə Azərbaycanın deyil, ümumən dünya aqrar elminə verilmiş bir töhfədir. Yeri gəlmişkən, Əyyub müəllimin nəşr edilmiş əsərləri ilə tanış olmuş bir dostumuzun obrazlı ifadəsi ilə desək, bu əsərlərin hər sətri altında bir kilo qızıl yatır. Qızıl onun araşdırmalarının nəticələrindədir. Zebunun çəkisinin 1500 kq-a çatdırılmasındadır. Camışlardan alınan südün yağlılığının 8-12 faiz olmasında, rekord camışlardan gündə 20-30 litr süd sağılmasındadır. Süni mayalamanın geniş tətbiqi ilə məhsuldarlığın dəfələrlə artırılmasındadır.

Əyyub müəllimin əsərlərinin dili olduqca aydın, sadə, oxunaqlı, tez anlaşılandır. Odur ki, bir tədqiqat obyekti kimi bu elmi irs çox cəlbedici, diqqətəlayiq, olduqca maraqlıdır.

İnanırıq ki, lap yaxın zamanlarda alimin elmi irsi sistemli şəkildə tədqiq ediləcək, öyrəniləcək.

Gəlin bu məsələni zamanın, bir də tədqiqatçıların öhdəsinə, insafına buraxaq.

O ki qaldı hörmətli akademikimizə, Əyyub müəllim bu gün də əvvəlki coşğu ilə işləyir. Çalışır ki, bütün əlyazmalarını, elmi əsərlərini çap elətdirib

oxuculara çatdırsın. "Azərbaycanda biologiya elminin və heyvandarlığın inkişaf tarixindən" adlı kitabı da bu qəbildəndir.

Kitab böyük bir dövrün və bu dövrdəki mövcud cəmiyyətin təsərrüfat fəaliyyətinin əsas sahələrindən birinin, iqtisadiyyatın önəmli istiqamətlərindən olan ictimai heyvandarlığın, eləcə də biologiya və heyvandarlıq elmlərinin inkişafının ümumi mənzərəsini yaradır, bunların üzərinə işıq salır.

Kitabda 49 elmi məruzə, 57 arayış toplanıb. Bunların vasitəsi ilə də heyvandarlığın elmi və təsərrüfat bazalarının ümumi vəziyyəti, heyvandarlığa münasibət, ona verilən önəm, bu sahəyə cavabdeh olan elmi və təsərrüfat, dövlət qurumlarının fəaliyyəti, aqrar elmin sahənin inkişafına yönəlmiş elmi-tədqiqat işləri, bunların təcrübədə təsdiqi, rayonlardakı heyvandarlıq təsərrüfatlarının, damazlıq-seleksiya, süni mayalama stansiyalarının və s. işlərinin istiqamətləndirilməsi, fərdi təsərrüfatlara münasibət kimi çoxsaylı məsələlərə aydınlıq gətirilir. Mövcud problemlər, ortada olan çətinliklər, həlli vacib məsələlər, bütün bunlar həlli yolları göstərilir, lazımi məqamda təkliflər də irəli sürülür, təsərrüfatların, hətta sahəyə məsul dövlət qurumlarının fəaliyyətinin səmərəliliyinin artırılması, daha düzgün istiqamətləndirilməsi, mövcud nöqsanların problemlərin tezliklə aradan qaldırılması məqsədi ilə nazirlik, komitə, birliklər səviyyəsində direktiv sənədlər şhazırlanır, tədbirlər görülür. Belə sənədlərdə də təbii ki, heyvandarlıq tariximizin müəyyən məqamları, anları, detalları öz əksini tapır, sahənin o dövrdəki ümumi mənzərəsini tamamlayır ki, bunlar da oxuculara təqdim olunur.

Kitabda haqqında bəhs olunan problemlər, aqrar elmi düşündürən, apardığı elmi-tədqiqatlar, araşdırmalar, həyata keçirmək istədiyi elmi-nəzəri nəticələr, təsərrüfatların, qarşısına çıxan problemlər hansılardır? Aparılan işlərin gedişi, əldə edilən nəticələr necədir? Təsərrüfatları geri salan hansı amillər, çətinliklər, problemlərdir? Bu problemlərin həlli yolları tapılırmı?

Kitabın birinci hissəsində toplanmış məruzələrdə bu və ya digər çoxsaylı məsələlərin üzərində dayanılır.

Həmin məsələlərin məruzələrdə öz əksini necə tapmasından danışmazdan öncə bir cəhət, bir xüsusiyyət üzərində dayanmaq istərdik.

Əvvəla, onu deyək ki, kitabda toplanmış elmi məruzələr, arayışlar onilliklərin məhsuludur. Bu onilliklər isə, həm də nəsillərin, münasibətlərin dəyişməsi, elmi problemlərə, təsərrüfat problemlərinə, kənd təsərrüfatı sistemində idarəetməyə, baxışların dəyişməsi də demək idi. Məsələn, bizcə, 50-ci illərdə, 70-ci illər arasında bu baxımdan fərqlər mövcud idi. Təbii ki, bu fərqlər quruluşun özündən, həmin quruluşun da idarə etdiyi cəmiyyətin, bütövlükdə sistemin üzündən gəlirdi. Həmin fərqlər də ümumilikdə ictimai heyvandarlığın inkişafına təsir edən amillər idi.

Əgər əllinci illərdə böyük ruh yüksəkliyi, ölkə həyatının bütün sahələrində, elmdə, texnikada böyük inkişaf var idisə, 80-ci illərdə bu coşqu, bu ruh yüksəkliyi artıq sezilmirdi. 50-60-70-ci illərdə qabarmış dənizin suları 80-ci illərdə artıq çəkilmişdi.

Təbii ki, heyvandarlıq sahəsi də bu tendensiyadan kənarda deyildi.

Kitabda da bu tendensiya aydın görünür.

Kitabdakı "Mal-qaranın məhsuldarlığının artırılması və keyfiyyətinin yaxşılaşdırılması yolları", "Azərbaycanda camışların doğub-törəmə qabiliyyətinin yaxşılaşdırılması yolları", "Yemləmə və bəsləmə şəraitinin heyvanların doğub-törəmə (çoxalma) fəaliyyətinə təsiri", "Kənd təsərrüfatı heyvanlarının törədicilərinin tənazül fəaliyyətinə və verdikləri toxumun kəmiyyət və keyfiyyətinə təsir edən amillər", "Qaramal və camışların məhsuldarlığının yüksəldilməsi və sayının artırılması tədbirləri", "Ekstremal iqlim şəraitində mal-qaranın məhsuldarlığının artırılmasında əsas şərtlər", "Süni mayalamanın camışçılıqda tətbiqinin elmi əsasları", "Camışların çoxalmasının biologiyası və süni mayalandırılmasının metod və texnologiyalarının işlənib hazırlanması", "Azərbaycanın heyvandarlığında süni mayalamanın geniş tətbiqi ən vacib dövlət tədbiridir", "Azərbaycanda ətlik maldarlığın inkişaf etdirilməsi tədbirləri", "Respublikanın təsərrüfatlarında, damazlıq işlərinin vəziyyəti haqqında", "Azərbaycanda seleksiya damazlıq işlərində intensiv texnologiyaların tətbiqi", "Azərbaycanda camışçılığın inkişafı və onun müalicəvi-dietik qida məhsulları istehsalındakı əhəmiyyəti", "Azərbaycanda damazlıq camışçılığın elmi əsasda inkişafı tarixindən" kimi onlarla məruzələrdə heyvandarlıqda süni mayalama kimi mütərəqqi, qabaqcıl metod və texnologiyaların geniş təğbiqi, damazlıq heyvandarlığın inkişaf problemləri, məhsul istehsalının artırılması, heyvanların çoxalma biologiyasının öyrənilməsi, yemləmə, bəsləmə kimi bir çox şəraitlərin çoxalmaya təsiri kimi problemlər öyrənilir, elmi həlli və təcrübədə, istehsalatda geniş həyata keçirilməsi yolları da göstərilir.

Məsələn, "Azərbaycanda camışların törəmə qabiliyyətinin yaxşılaşdırılması" elmi məruzəsi 1951-53-cü illərdə Xıllı rayonunun (indiki Neftçala) İ.V.Stalin adına kolxozunda aparılan təcrübələr zamanı camışların cinsi fəaliyyətinə, hövrə gəlmə, döllənmə qabiliyyətinə yemləmə, iqlim, saxlama-bəsləmə şəraitlərinin təsiri, kəllərin, tənasül refleksləri, yemləmə tiplərinin törədici buğaların və kəllərin qeyri-şərti reflekslərinə, toxumlarının kəmiyyət və keyfiyyətinə, yemləmənin camışlara təsiri və onlardan alınan balaların yaşama qabiliyyətinə təsirinin öyrənilməsindən bəhs edir. Aparılan təcrübələr zamanı müəyyən edilir ki, camışların həvəsə gəlməsi, döllənməsi əsasən otlaq və meteroloji şəraitdən asılıdır. Camışların törəmə qabiliyyətini yaxşılaşdırmaq, qısırlığı aradan qaldırmağın yolu yüksək keyfiyyətli, tərkibində çoxlu karotin olan yemlərlə yemləyib əlverişli meteroloji şəraitdə bəslədikdə doğduqdan 16-22 gündən sonra hövrə gəlib cütləşir. Bu isə çoxalmaya, nəticədə isə məhsuldarlığın artırılmaısna birbaşa təsir edən amildir.

Belə elmi nəticələrə gəlinməsi, heyvandarlığın inkişafına aparan elmi qənaətlər bütün məruzələrə xasdır.

Məruzələr müxtəlif vaxtlarda, müxtəlif auditoriyalarda oxunub.

Elmi mahiyyətinə, respublika heyvandarlığının o dövrdəki inkişaf potensialına, bu potensialın düzgün istiqamətləndirilməsinə, istifadə edilməsinə, ayrılıqda götürdükdə bölgələrdə, bütövlükdə isə respublika üzrə sahənin inkişaf səviyyəsinə, mövcud imkanlara, yerli şəraitə qiymət verilməsi, araşdırılması baxı-

mından kitabın ikinci hissəsində verilmiş arayışlar və təkliflər mühüm əhəmiyyətə malikdir.

"Azərbaycanda heyvandarlıq məhsulları istehsalının yüksəldilməsində süni mayalamanın əhəmiyyəti barədə", "Mərdəkan qəsəbəsində təşkil edilmiş Abşeron Dövlət Damazlıq və Süni Mayalama Stansiyasının işi haqqında", "Azərbaycan şəraitində kənd təsərrüfatı heyvanlarının doğub-törəməsinin vəziyyəti və qısırlığı ilə əsas mübarizə tədbirləri haqqında", "Azərbaycan SSR-də damazlıq işlərinin vəziyyəti haqqında", "Respublikada maldarlığın vəziyyəti haqqında", "Azərdamazlıq" Birliyi tərəfindən son illərdə görülən işlər barədə", "Respublikanın rayonlarına cins mal-qara gətirilməsi və həmin heyvanlarda süni mayalamanın təşkili və aparılması haqqında", "Dövlət Üzümçülük və Şərabçılıq Komitəsinin təsərrüfatlarında baytarlıq işinin vəziyyəti haqqında" kimi rəsmi sənədlərdə heyvandarlığın ümumi, heyvandarlığın maldarlıq, camışçılıq, qoyunçuluq, atçılıq, dəvəçilik, quşçuluq, arıçılıq və s. kimi sahələrinin ayrılıqdakı vəziyyətini əks etdirən rəqəmlər, faktlar, cədvəllər verilir. Kənd Təsərrüfatı Nazirliyi, "Azərdamazlıq" Birliyi, Dövlət Üzümçülük Komitəsi, Dövlət Seleksiya-Damazlıq stansiyaları, Süni mayalama stansiyaları kimi qurumların konkret işləri barədə zəngin məlumatlar əldə etmək, bunların fəaliyyətini öyrənmək olar.

Bunlarla yanaşı, süni mayalandırmanı aparılması, məhsul istehsalının artırılması, ətlik-südlük cinslərin yetişdirilməsi, camışçılığın inkişaf etdirilməsi, baytarlıq işinin vəziyyəti, xəstəliklərə qarşı mübarizə kimi sahələrin arayışlarda konkret faktlarla oxuculara çatdırılır.

Arayışlarda mülahizələr bildirilmir, konkret fikirlər, real rəqəmlər göstərilir. Bu real rəqəmlərin arxasında isə ictimai mülkiyyətin xüsusiyyətləri, özünəməxsusluğu, problemləri dayanır. Müəllif bütün bunları rəqəmlərin, faktların vasitəsilə açır. O dövrdə bu baxımdan açıq münasibət bildirmək olmazdı.

Əslində müəllif münasibət bildirirdi. Faktların dili ilə. Bu münasibət xaricdən, Rusiyadan, Pribaltikadan gətirilən cins mal-qaraya yanaşmada özünü göstərirdi. Belə ki, həmin heyvanlar yerli şəraitə çətin uyğunlaşır, yemləmə-bəsləmə, iqlim şəraiti onlardan istifadə olunmasını çətinləşdirir. Xüsusi qulluq, xüsusi yem rasionu tələb edir, bunlar da külli miqdarda vəsait demək idi. Qarşılığı isə ilk dövrlərdə gözlənildiyindən az olurdu. Bu da iqtisadi cəhətdən səmərəli deyildi.

Bu heyvanlar respublikamızın ekologiyasına uyğun gəlmir. İnsan və heyvanlar arasında ağır xəstəliklər, vərəm, brüsellyoz, leykoz, xərçəng kimi xəstəliklər yayırlar. Öz məhsulları ilə insan orqanizminə, sağlamlığına ziyan verir, zəhərli preparatlarla çimizdirildiklərindən ekologiyanı çirkləndirirlər. Həm də həmin zəhərli preparatların həmin heyvanların ətinə, qanına, südünə keçməsi səbəbindən insan orqanizmi də zəhərlənmələrə, xəstəliklərə düçar olur.

Alimimiz isə bu problemin həllini belə görür.

Dünya genefondundan Azərbaycanda səmərəli istifadə etməklə yalnız heyvandar alim və bioloqların, baytar alimlərin, respublika damazlıq sistemi mütəxəssislərinin məsləhətləri, layihələri əsasında, həm də gündəlik nəzarəti altında, yerli şəraitimizə, ekologiyamıza uyğun, xəstəliklərə davamlı, yeni, yüksək məhsuldar südlük-ətlik qaramal cinslərinin, hibrid cinslərinin yaradılması məq-

sədilə rekord döllük buğaların dondurulmuş toxumlarını gətirib süni mayalama aparmaq lazımdır. Bu yolla alınan cinslərin damazlıq təsərrüfatları yaradılmalıdır. Bu baxımdan Qolştinfriz, Cerzey, zebu və zebu hibridləri daha məqsədə uyğundur.

Bu daha səmərəli, daha effektli yoldur. Bu yol arayış və məruzələrdəki faktlar və rəqəmlərdə, elmi nəticələrdə özünü aydın göstərir.

Çox təəssüf ki, bu ziyanlı tendensiya bu gün də davam edir.

Məruzələrdə və arayışlarda aydın görünən bir məsələ də var. Bu həm, müəllifin Azərbaycan Elmi-Tədqiqat Heyvandarlıq İnstitutunun direktoru, "Azərdamazlıq" Birliyinin rəisi, Dövlət Şərabçılıq Komitəsinin sədr müavini və s. məsul vəzifələrində çalışarkən özünün, həm də bütövlükdə aqrar sektorunun fəaliyyət istiqamətləri, bu istiqamətlərin yönəldiyi məqsədlər, əldə olunan nəticələrdir. Bu nəticələr isə insan ömrünün, insan zəkasının, elm xadiminin xalqı, milləti qarşısındakı xidmətinin barıdı, bəhəridi.

Əyyub Bəşirov yaradıcılığının bir səhifəsi olan "Azərbaycanda biologiya elminin və heyvandarlığın inkişaf tarixindən" kitabı heyvandarlıq tariximizin, onun bəlli bir mərhələsinin salnaməsidir.

Əyyub Bəşirovun elmi-məruzələri onun elmi yaradıcılığının ilkin təməl daşlarıdır. O, hələ Gəncə Kənd Təsərrüfatı Akademiyasında, K.A.Timiryazyev adına Moskva Kənd Təsərrüfatı Akademiyasında, ÜHİ-nun aspiranturasında təhsil aldığı illərdə tələbə elmi cəmiyyətlərində, müxtəlif elmi dərnəklərdə tez-tez elmi məruzələrlə çıxış edirdi.

Moskva elmi mühiti tərəfindən təqdir edilən həmin elmi məruzələr alimin yaradıcılığının bir istiqaməti, xətti kimi formalaşmağa, möhkəmlənməyə, tədqiq etdiyi mövzu, problemlərin elmi həlli, həmin mövzuların aktuallığı baxımından daha da böyük məna kəsb etməyə, bitkinləşməyə başladı. Təbii ki, bunun da məntiqi nəticəsi olmalı idi.

Həmin məntiqi nəticə isə həmin elmi məruzələrin beynəlxalq elmi arenada, beynəlxalq elmi ictimaiyyət tərəfindən qəbul edilməsi, bəyənilməsi, yüksək qiymətləndirilməsi idi.

1964-cü il sentyabrın 6-dan 13-nə kimi İtaliyanın Trento şəhərində V Beynəlxalq Elmi Konqres keçirildi. Bu böyük, beynəlxalq elmi məclisdə 64 ölkədən 1200 nəfər alim iştirak edirdi. Həmin elmi məclisdə Əyyub Bəşirov "Camışların törəyib çoxalmasının biologiyası və süni mayalandırılması" mövzusunda elmi məruzə etdi.

Böyük maraqla dinlənilən elmi məruzə bioloqların V Beynəlxalq Konqresində birinci yeri tutdu və qızıl medala layiq görüldü. Roma Papası VI Pavel şəxsən özü alimimizi böyük uğur münasibətilə təbrik etdi və öz portretini hədiyyə verdi.

Bu uğur təkcə Əyyub Bəşirovun deyildi, bu həm də Azərbaycan aqrar elminin uğuru, ona verilən yüksək qiymət idi.

Əyyub Bəşirovun məruzələri daşıdığı elmi yükü, mahiyyəti, əhəmiyyətindən savayı, yazıçıların, ədəbiyyatşünas alimlərin təbirincə desək, sənətkarlıq baxımından da güclüdür. Məruzələrin dili çox rəvan, axıcı, lakonik, ifadələr sər-

rast və dəqiqdir. Fikirlər aydın və konkret ifadə olunur. Bütün bunlar da istər oxucunu, istərsə də dinləyicini yorulmağa qoymur, mövzuya olan marağını və diqqətini artırır.

Əyyub Bəşirov keçən əsrin 70-ci illərində BDU-nun nəzdində ali məktəb müəllimlərinin ixtisasartırma fakültəsində təbiətin və ekologiyanın mühafizəsi mövzusundakı çox əhəmiyyətli mühazirələr oxumuşdu. Keçmiş İttifaqın, o cümlədən Azərbaycan ali məktəblərinin müəllimlərinin də dinlədiyi bu mühazirələr böyük maraqla qarşılanırdı.

Əyyub Bəşirov 1970-ci illərin sonu, 1980-ci illərin əvvəlində "Azərdamazlıq" Birliyinin rəis müavini Tağı İsmayılovla birlikdə BDU-nun nəzdində respublikamızda ilk dəfə, analoqu olmayan məktəb -- Ali Genetika Məktəbi yaratdı. Yüksək səviyyəli seleksioner-genetiklərin hazırlanmasında bu məktəbin müstəsna əhəmiyyəti oldu.

Əyyub Bəşirov ötən əsrin 50-60-cı illərində Qarşılıqlı İqtisadi Yardım Şurasını təşkil etdiyi konqreslərdə, elmi simpoziumlarda daim iştirak edir, heyvandarlığın müxtəlif sahələrinə, problemlərinə aid mühazirələr, məruzələrlə çıxış edirdi. O, 1954-64-cü illərdə Zaqafqaziya respublikaları arasında yeganə alim, mütəxəssis idi ki, QİYŞ-nın biologiya və heyvandarlıq bölməsinə üzv seçilmişdi. Alimimiz bu beynəlxalq qurumdakı müntəzəm fəaliyyəti, elmi tədbirlərdki məruzələri, çıxışları, tövsiyələri ilə böyük nüfuz qazandı.

Əyyub Bəşirov dünya aqrar elmi tarixində ilk dəfə törədici kəllərin toxumunun standartını işləyib hazırlayıb. Bu unikal elmi iş Beynəlxalq Standartlaşdırma Komitəsinin sifarişi, akademik Viktor Konstantinoviç Milovanovun və akademik Lev Konstantinoviç Ernstin elmi məsləhətçiliyi ilə aparıb.

Əyyub Bəşirovun rəhbəri və icraçısı olduğu "Kəllərin dondurulmuş toxumunun standartı" layihəsi akademik Firuz Məlikov adına Azərbaycan Elmi Tədqiqat Heyvandarlıq İnstitutunun Abşeron Təcrübə Stansiyasının 1972-1975-ci illəri əhatə edən "Törədici kəllərin toxumunun standartı layihəsinin hazırlanması və camışların süni mayalanmasının xüsusiyyətlərinin öyrənilməsi" mövzusundakı hesabata əlavə edilərək 1976-cı ildə Beynəlxalq Standartlaşdırma Komitəsinin Moskvadakı katibliyinə təqdim olunub.

Bu gün də həmin standart dünya heyvandarlıq elmində və təcrübəsində əsas götürülür, onun əsasında da dondurulmuş kəl toxumunun beynəlxalq miqyasda alqı-satqısı aparılır.

O dövrdə FAO, YUNESKO kimi beynəlxalq təşkilatların dərgilərində elmi məqalələrlə çıxış edən alimimiz elə indi də onlarla əməkdaşlığını davam etdirir. FAO dünyada camışçılığın inkişaf etdirilməsi, camışçılığın potensial imkanlarının öyrənilməsi, araşdırılması, məhsul istehsalının artırılması kimi bir çox məsələlərin həllində Əyyub Bəşirovla məsləhətləşmələr, fikir mübadiləri aparır.

Rusiya elmi dairələri, elmi qurumları Əyyub Bəşirovla sıx əməkdaşlıq edir. Mütəmadi olaraq onu öz elmi məclislərinə dəvət edirlər.

2004-cü il mart ayının 24-də Rusiya Beynəlxalq Keyfiyyət Problemləri Akademiyasında akademik V.K.Milovanov və professor İ.İ.Sokolovskayanın 100 illik yubileyləri münasibətilə keçirilən Beynəlxalq Elmi Konfransda Əyyub

Bəşirov "Методы и технология искусственного осеменения и прогресс в животноводстве Азербайджана" ("Süni mayalanmanın metod və texnologiyası və Azərbaycanda heyvandarlığın tərəqqisi") mövzusunda elmi-məruzə ilə çıxış etdi.

Konqresdə birinci yeri tutan bu məruzəyə görə Rusiya Beynəlxalq Keyfiyyət Problemləri Akademiyası alimimizi özünün həqiqi üzvü seçdi. Rusiya AAK-sı isə ona biologiya elmləri doktoru elmi dərəcəsi verdi. Həm də Rusiya Kənd Təsərrüfatı Akademiyasının və ÜHİ-nin fəxri fərmanı verildi.

Bu Əyyub Bəşirov yaradıcılığının, Azərbaycan aqrar elminin nüfuzunun beynəlxalq səviyyədə etiraf olunması, təsdiqi idi.

Onu da qeyd edək ki, alimin yaxın dostu, tələbə yoldaşı Rusiya Kənd Təsərrüfatı Elmləri Akademiyasının vitse-prezidenti, akademik Lev Konstantinoviç Ernstin elmi məsləhətçisi olduğu Əyyub Bəşirovun növbəti kitabı -- "Биолоэийа и разведенийа селскохорзйайственных животных" əsəri də bu yaxınlarda Moskvada işıq üzü görəcək.

Alim elmi yaradıcılıq, eləcə də ictimai fəaliyyətini bu gün də uğurla davam etdirir. Onun yeni kitabları çapa hazırlanır.

Əyyub Bəşirov Azərbaycan Heyvandarlıq Assosiasiyasının prezilentidir. O, bu ictimai quruma rəhbərlik etməklə yanaşı, Azərbaycan Camışçılar İttifaqının, Azərbaycan Arıçılar İttifaqının fəaliyyətinin istiqamətləndirilməsində fəal iştirak edir.

Hörmətli oxucularımıza təqdim etdiyimiz "Azərbaycanda biologiya elminin və heyvanlarlığın inkişaf tarixindən" kitabı da aqrar elmimizin, heyvandarlıq tariximizin yeni səhifəsidir. Ümidvarıq ki, bu kitab da oxucuların, mütəxəssislərin, tədqiqatçıların, elmi ictimaiyyətimizin böyük marağına səbəb olacaq.

Söhbətimizin sonunda bir fikrimizi də bildirmək istərdik ki, Əyyub Bəşirovun elmi yaradıcılığı böyük, həm də zəngin bir irs kimi gələcək nəsillərə töhfədir, həm də əmanətdir. Əsrlər ötəcək, nəsillər dəyişəcək, xalqımız bu irsi qoruya-qoruya ondan bəhrələnəcək.

*Heyvandarlıq*

# ZEBU VƏ ZEBUÇULUQ

**Aqil Mehdiyev**, *Azərbaycan Elmi Tədqiqat Heyvandarlıq İnstitutunun elmi işçisi*
**Suliddin Abbasov**, *kənd təsrrüfatı elmləri namizədi, Azərbaycan Dövlət Aqrar Universitetinin dosenti*

Zebu və zebunövlü heyvanların inkişaf etdirilməsi haqqında keçmiş SSRİ-nin Kənd Təsərrüfatı Nazirliyinin 07. 1 ə2.78 №318, 11.03.82 il №70,11 dekabvr 1981 ildə 360 -№li əmrləri. .

Azərbaycan Respublikası Kənd Təsərrüfatı Nazirliyinin 02 avqust 1984-cü il 685№li (sənaye texnalogiyası tələblərini ödəyən kənd təsərrüfatı heyvan cinslərinin yaradılmasının sürətləndirilməsinə dair tədbirlər) əmri zebuçuluğa olan marağı artırmış və geniş yayılmasına köməklik etmişdir. Zebu əsasında hibritləşmənin aparılması regionlarda yüksək məhsuldar ətlik və südlük hibrid naxırlarının yaradılmasına səbəb olmuşdur.

Zebu və zebunövlü mal öz möhkəm konstitutsiyası, yüngül və möhkəm sümüyü, bərk dırnağı, qan parazitar xəstəliklərə dözümlülüyü və yemə az tələbkarlığı, mühitə tez uyğunlaşması ilə fərqlənir.

Yer üzərində zebunun ən çox baş sayina görə yayılma ocağı Asiya və Afrika ölkələridir ki, məhs o mənbədə əsas mənşəə hesab olunur. Sonrakı dövürlərdə zebu (hürgüclü mal ) tezliklə Latın Amerikası, Kuba, Avstraliya, yeni Zellandiya ölkəl ərinə çox sürətlə yayilmış və yeni cins və tiplərin yaradılması əsasını qoyaraq avropa mənşəli qaramaldan üstünlük təşkil etmişdir.

Zebunun əcdadı haqqında bir fikir yoxdur.Bir çox tədqiqatçılar onun sərbəst növ olduğunu, başqaları qaramalın nəzdində olan bir növ kimi, üçüncüləri isə qaramala uyğun mal hesab edirlər.

L.Ryutumayer sklet quruluşuna görə qaramalı iki növə ayırır: xüsusi qaramal və zebu. Müəyyən keyfiyyət əlamətlərinə görə zebunun sərbəst forma olması haqqında Ç.Darvin yazır "Qəbul edilmiş kəmiyyət müxtəlifliyi xarici forma və xüsusiyyəətləri, sümüklərin quruluşu hərəkət və xüsusiyyətlərinə əsasən belə fikrə gəlmək olar ki, hürgüclü (fırlı ) və hürgücsüz mallar ayrı –ayrı növ kimi qəbul edilməlidir.

Ç.Darvin qeyd edir ki, bir çox əlamətlərə (səs, bədən quruluşu) görə adi qaramal hürgüclü (fırlı) maldan fərqlənir.

Ç.Darvin Zebunun sərbəst mal olması fikrini söyləməsinə baxmayaraq bir çox alimlər müxtəlif fikirlərdə olmuşlar. Məsələn B.Sviçuk qeyd edir ki, zebunun bütün cinsi qaramala oxşar morfoloji quruluşa malikdirlər. Ona görə zebu qaramal növünə aid olmasını göstərirlər. C.Byuffon zebunun balaca bizon olması fikrini söyləyir.

K.Keller qeyd edir ki, zebu əhliləşdirilmiş banteqdir. Alim erkək banteqin kəllə sümüyünün zebunun kəllə sümüyünə uyğun gəlməsi fikrini söyləmişdir.

Zebunun əcdadı Banteq olması fikrinin düzgün olmamasını təsdiq edərək L.Adamesem və R.Laydekkerom zübunun kəllə sümüyünün turun kəllə sümüyünə uyğun gəlməsini qeyd etmişlər.

U.Dyurst isə zebunu qaramalın bir növü kimi qəbul edir. Bir sıra alimlərin firlı və firı olmayan adi qaramal üzərində apardıqları morfoloji tədqıqatların nəticəsinin ümumiləşdirmiş və müqayisəli surətdə təhlili göstərmişdir ki, zebu bütün morfoloji nişanələrinə, həmçinin xronoloji xüsusiyyətlərinə görə qaramala çox yaxındır.

Bu tədqiqatlar göstərir ki, bütün əlamətlərə görə zebu banteqdən çox qaramala uyğun gəlir, S.N.Boqolyubovski Asiya və Afrikada zebunun əcdadı tur olmasını qeyd edir.

Aparılan tədqiqatların yekunundan aydın olur ki, firlı və firsız mallar bir-birindən ferqlenirlər. Zebunun kəllə sümüklərinin quruluşuna görə əcdadı tur olması fikrini N.Episteynu öz nəticələrində çıxarmışdır.

Hazırda bir çox alimlər zebunun Bos namadicus digəri isə Bos primigenius olduğunu söyləyirlər.

Qədim mədəniyyət abidələri bir sıra arxeoloji qazıntılar müasir cins və tiplər zebunun əcdadı, coğrafi yayılması haqqında lazımi material verir.

Heyvanları mənşəyi və əhliləşdirilməsi nəzəriyyesinin müzakiresinde V.Qerre belə nəticəyə gəlir ki, zebunun tropik subtropik mühütə uyğunlaşması qaramal kimi müəyyən dövr keçmişdir.

Alimlərin fikrinə görə, zebunun formalaşma merkezi Hindistanın şimali və merkezi hissesi olmuşdur. Zebunun burada çox olması və müxtəlif amillər bu fikrin düzgünlüyünü də sübut edir. Bu fikrin düzgün təsdiq olunmasını bir çox müəlliflər də təsdiq edir (N.Episteyn, Q.Frederiks, Çayld və s.)

Bizim eradan 3 min il əvvəl müasir zebuya uyğun firlı malın Hindistan və Pakistan ərazeilərində hindistan mənşəli mal olması göstərilir. Moxondce – Daro qazıntılarında, möhürlərdə (Pakistanın Sind krallığı) qədim əl yazmalarında, şəkillərdə hürgücsüz mal ilə yanaşı hürgüclü (firlı) mal şəkillərində rast gəlinmişdir. Daro qazıntılarında I zebu törədicisinin şəklinin bizim eradan əvvəl 2000 ilə uyğun gəlməsi qeyd edilir. Zebudan məhsuldar heyvan kimi yox eyni zamanda işlək mal kimi istifadə edilib.Tarixi materiallar firlı malın- zebunun hind krallığında yetişdirilməsi təsdiq edir.

Azərbaycan respublikasında zebunun yayılmasının ilk izlərinə eramızdan əvvəlki 2000-2500-cu illərdə rast gəlmək olur. Fransız arxeoloqu Can De-Morqanın Lənkaran ərazisində aşkar etdiyi nadir tapıntılar içərisində, üzərində zebu təsvir olan möhür yuxarıdakı fikri təsdiq edir.

Azərbaycan Elmlər Akademiyasının respublikanın Fizuli rayonun "Yeddi təpə" ərazisində apardığı arxeoloji qazıntılar nəticəsində əldə etdiyi faydalı tapıntılar içərisində tunc zebu fiqurları da vardır. Həmin fiqurlar yeni eradan əvvəlki I minilliyə aiddir. Həmçinin Mingəçevir torpaq qəbirlərindən əldə edilən maddi-mədəniyyət abidələri içərisində eramızdan əvvəlki V-IV əsrlərə aid-orijinal tunc üzük möhür də tapılmışdır. Belə bir ehtimala əsas vardır ki, tarixin hər hansı dövründə xalq möhür və bəzək şeyləri üzərində ancaq sevdiyi və faydalandığı bir heyvanın təsvirini verə bilərdi. Əgər eradan V-IV minillikdə

möhür üzərində zebunun təsviri verilmişsə bu onun həmin dövrdə xalq tərəfindən çox sevilməsini göstərir. Heç bir şübhə ola bilməz ki, zebu həmin yerlərdə onun əşya üzərində təsvirinin verildiyi dövrdən çox-çox əvvəl yetişdirilmişdir. Belə olduqda Zebunun Azərbaycanda yaranma : yetişdirilmə və inkişaf etdirilmə tarixi onun vətəni sayılan Hindistan ərazisində yaranma tarixinə çox yaxınlaşır. Burada iki fikir ola bilər birincisi, eramızdan əvvəlki V-IV minilliklərdə Hindistan-Azərbaycan ticarət əlaqələrini geniş olması sayəsində zebunun Hindistandan başqa ölkələrə nisbətən Azərbaycana daha əvvəl gətirilməsi ehtimalı, ikinci Azərbaycan ərazisinin özündə turdan zebunun yaranma ehtimalı hər iki məsələnin elmi həlli Azərbaycan heyvandarlığının inkişaf tarixi baxımından son dərəcə vacibdir. İstər eramızdan əvvəlki dövrdə, istərsə də eramızın başlanğıcında zebu dünyanin bir sıra başqa ölkələrinə aparılmış, orada həm təmizlikdə yetişdirilmiş həm də yerli qaramalın hibridləşməsində istifadə edilmişdir.

Odur ki, Çində, Hindi-Çində, Pakistanda bir sıra Asiya ölkələrində, yaxın və Orta Şərqdə, Bəzi Şimali, orta və Cənubi Afrika ölkələrində ,Cənubi Amerika ölkələrində həm zebu həmdə zebu növlü qaramal yetişdirilmişdir.Həmin ölkələrin bəzilərində də zebu çox uzaq tarixə malik olmuş və keçmiş dövürlərdən indiyədək müvəffəqiyyətlə yetişdirilmişdir. Müxtəlif ölkələrdə yetişdirilmiş zebular da öz morfoloji və bioloji xüsusiyyətlərinə görə bir-birindən müəyyən qədər fərqlənir. Ona görə də həm yuxarıda şərh olunanlara, həm də zebunun yayılma arealının genişliyini müxtəlif ölkələrdə onun sayının sürətlə artmasının nezerə alaraq professor Z.Q.Verdiyev ayrı-ayrı ölkələrdə yetişdirilən yerli zebuları həmin ölkənin adı ilə aşağıdakı kimi adlandırmağı məqsədəuyğun hesab etmişdir. Boz zebu indius, Boz zebu franicus, Boz zebu afrikanius və saire. Bunların hamısı isə Boz zebu adı altında getməlidir.



Brazilyanın İndubrazil zebu cinsi.



Qir zebu cinsi.

Zebu malının ən geniş yayılma arealı ekvatora nisbətən 35-40 dərəcə şimala və cənuba doğru bir ərazini əhatə edir. Son illərdə zebu malın vətəni Hindistan olmasına baxmayaraq Brazilya, Amerika, Avstraliya, Yeni Zelandiya, Kuba dövlətlərində ən məşhur, ətlik və südlük cinslərin yaranması geniş vüsət almışdır. Brazilyada 155 milyon başdan çox qaramal vardır ki, bunun 70 %-dən çoxu zebu və

